Sadiq yol axtaranlar üçün

# İMAM SADİQİN (Ə) NƏSİHƏTLƏRİ

MÜƏLLİF:
USTAD MİSBAH YƏZDİ

TƏRCÜMƏ EDƏN:
MƏHƏMMƏD AZƏRİ

# Mündəricat

## SADİQ YOL AXTARANLAR ÜÇÜN İMAM SADİQİN (Ə) NƏSİHƏTLƏRİ

### Kitab haqqında

Kitabın adı:SADİQ YOL AXTARANLAR ÜÇÜN İMAM SADİQİN (Ə) NƏSİHƏTLƏRİ

Müəllif:Ustad Misbah Yəzdi

Tərcümə edən: Məhəmməd Azəri

:Naşir

:Çap tarixi

Səhifələrin sayı:۲۱۴

Çap növbəsi:Birinci

Tirajı:۳۰۰۰

səh:۱

### İşarə

## Ön söz

Təkamül yolunda insanın agah və sadiq mürəbbi və rəhbərə malik olması zəruri və əsas şərtlərdəndir. Yalnız özü doğru yolu tapmış insan başqalarına yol göstərə bilər. Bundan əlavə, rəhbər əlindən tutduğu adamı həqiqi kamilliyə apararkən yalnız onun .xeyrini düşünüb, sədaqətli və canıyanan olmalıdır

Həqiqət axtaran insanlar deyilən xüsusiyyətlərə malik rəhbər tapmaq üçün bir çox çətinliklərə mə'ruz qalmışlar. Bir çox insanlar azğın, hiyləgər və talançı şəxsi bələdçi seçməklə kamillik və səadət əvəzində cəhalət və süquta düçar olmuşlar. Ona görə də həqiqət aşiqləri bu mühüm işdə böyük həssaslıqla və davamlı olaraq Allah-təaladan .yardım diləməlidirlər

Həqiqətə çatmaq üçün iki sadiq rəhbər vardır ki, insan onların yardımı ilə fitnə dalğalarını adlayıb doğru yola çata bilər. İslam Peyğəmbəri (s) «Sizin üçün iki ağır əmanət qoyub gedirəm» deməklə, Qur'an və Əhli-beytin (ə) əhəmiyyətini xüsusi .olaraq vurğulayır

Çox vaxt hədislərdə «Qur'ani-samit» və «Qur'ani-natiq» ifadələri ilə rastlaşırıq. «Qur'ani-samit» dedikdə bütün digər kitablar kimi danışmaq iste'dadı olmayan Qur'ani-Kərim nəzərdə tutulur. «Qur'ani-natiq», yə´ni «danışan Qur'an» məfhumu isə həzrət Əli (ə), Fatimeyi Zəhra (s.ə) və onların on bir övladına aid edilir. Əhli-beytin (ə) .həqiqi nümayəndələri də ilahi məqama malik olan məhz bu şəxsiyyətlərdir

Biz həqiqət aşiqlərini təkamül səfərində «danışan Qur'an», Əhli-beyt sülaləsinin nümayəndəsi imam Sadiqlə (ə) yoldaşlığa çağırırıq. Bu kitabda ustad Məhəmmədtəqi Misbah Yəzdinin Qum Elm mərkəzində

tədris etdiyi əxlaq dərsləri toplanmışdır. Alim öz söhbətlərini imam Sadiqdən (ə) nəql olunmuş rəvayətlər əsasında qurmuşdur. İmam Sadiq (ə) bu nurlu kəlamları öz yaxın səhabələrindən olan Əbdullah ibn Cündəbə müraciətlə buyurmuşdur. Bu buyuruqlar Allaha yaxınlaşmaq arzusunda olan və özünütərbiyə yolunda qədəm götürmüş .insanlar üçün böyük əhəmiyyətə malikdir

Naşir

İnsanın bəlkə də ən dərin fitri istəyi mə’nəvi kamilliyə çatmaqdır. İnsan daim fitri bir itkinin axtarışındadır. O, bir quş tək ilahi fəzada yüksəkliyə can atır. İnsan daha ali məqama çatmaq, Allah haqqında olan fitri biliyini həqiqi biliyə çevirmək arzusu ilə yaşayır. O, öz mə’rifətini artırmaq, içində hiss etdiyi boşluğu doldurmaq istəyir. Bu isə yalnız Allaha yaxınlaşmaqla mümkündür. Buna görə də, tarix boyu müxtəlif tayfalar mə’nəvi kamilliyə çatmaq üçün yollar aramış və bunu «irfan» adlandırmışlar. İrfan hissi bütün insanların fitrətinin dərinliyində mövcuddur. Amma bunun ən yüksək nümunəsi peyğəmbərlərin və övliyaların, xüsusi ilə İslam Peyğəmbəri (s) və Mə’sum İmamların (ə) fitrətindədir. Onların ardınca gedib göstərişlərinə əməl edənlər bu axtarışda daha asanlıqla müvəffəqiyyətə nail olurlar. Amma digər yollarda və məsləklərdə kifayət .qədər yanlışlıqlar vardır

Daxilimizdəki Allaha yaxınlaşmaq istəyinə lazımi qədər diqqət yetirə bilsək, nəyin axtarışında olduğumuzu anlayarıq. Amma bu istək nəfsani istəklərin çəkdiyi pərdə arxasında qalsa elə zənn edəcəyik ki, axtardığımız pərdə önündə dayanmış nəfsin istəyidir. Hansı ki, fitri ehtiyac yalnız Allaha yaxınlıqdır. Səmavi kitablar və ilahi şəriətlər, eləcə də bütün peyğəmbərlər insanı mə’nəvi təkamül yoluna yönəldən ilahi .vasitələrdir

Nəfis və dəyərli olan şeylərin düşməni çoxdur. Çox qiymətli malın saxtası da çox olur. Məsələn, almaz çox qiymətli daş olduğundan digər daşları ona oxşadaraq almaz adı ilə satmağa çalışanlar çoxdur. Həqiqi irfana çatmaq üçün kamil ixlasa, düzlüyə və əzmkarlığa ehtiyac vardır. İrfanın da mərhələləri vardır. Hər kəs səʾy və tutumuna uyğun mərhələyə çata bilər. Mümkündür ki, milyon insan arasında yalnız bir neçə nəfər irfanın ali mərtəbəsinə çata bilsin. Qiymətli mala olan sevgi ona saysız-hesabsız müştəri toplayır. Müştərinin çoxluğu və həqiqi malın ələ gətirilməsinin çətinliyi saxta mal təklif edənlərin də sayını artırır. Təəssüf ki, müasir dünyamızda saxta irfan bazarı ayaq tutub yeriyir. Belə bir vəziyyətdə həqiqi irfanı necə təʾyin edək ki, son kamillik ?məqamına çata bilək

Bu mühüm məqsədə çatmaq üçün Əhli-beyti və onun məktəbini yaxşıca tanımaq və hər bir şeyin həqiqətini onun məhək daşında yoxlamaq lazımdır. Əldə edilən hər bir məʾlumat, qarşıya çıxan hər bir göstəriş Əhli-beyt buyuruqları ilə tutuşdurulmalı, bununla uyğun gələnlər həqiqət hesab olunmalıdır. Bu üsuldan istifadə etməklə bəşər tarixi boyu hazırlanmış təkamül proqramlarının nə dərəcədə faydalı olub-olmadığını .müəyyən etmək olar

Bu mövzuda nəql olunmuş rəvayətlərdən biri də imam Sadiqin (ə) Əbdullah ibn Cündəbə vəsiyyətidir. Yaxın səhabələrdən olan Əbdullah ibn Cündəb yüksək məʾnəvi və irfani məqama nail olmuşdu. Bu vəsiyyətdə İmam (ə) doğru yol yolçularını qarşıdakı böyük təhlükələrdən xəbərdar edir. Şükürlər olsun ki, dinlərin ən kamili olan

İslamı və İslamın ən kamil olan Əhli-beyt məktəbini seçmişik. Doğru yolu tapsaq da .çox mühüm bir nöqtəyə diqqətli olmalıyıq

## DOĞRU YOL YOLÇUSU ÜÇÜN ƏN BÖYÜK TƏHLÜKƏ

Rahattələblik və tənbəllik həmişə insanladır. Bu xüsusiyyətlər bais olur ki, müəyyən bir təkamül pilləsinə qalxmış insan işini bitmiş bilib rahatca oturur. Hansı ki, təkamül nərdivanında yuxarı qalxdıqca yıxılmaq təhlükəsi daha da artır və insandan daha böyük diqqət tələb olunur. Dağın ətəyində dayanmış, yoxsa onun zirvəsinə dırmaşmış insan üçün təhlükə daha böyükdür? Təkamül yolunda bizim də vəziyyətimiz belədir. İslam dini və Əhli-beyt məktəbini seçmək müəyyən bir irəliləyiş hesab olunsa da, bu .mərhələdə büdrəmək böyük təhlükələrə səbəb ola bilər

Şeytan böyük düşməndir. O and içib: «(Pərvərdigara) And olsun izzət və cəlalına, bütün insanları azdıracağam»(۱). Şeytanın məqsədi insanı doğru yoldan azdırmaqdır. Təkamül yoluna qədəm qoymamış insan azğın olduğundan şeytan belələrindən uzaqdır. Şeytan üçün kamilləşmək istəyən insan maraqlıdır. İnsan təkamül yolunda .irəlilədikcə şeytan da öz sə'ylərini artırır

Doğru din və doğru məktəb seçməklə əsl təkamül yolunu tutmuş insanla şeytan qatı düşməndir. Şeytan belə bir insana qarşı bütün qüvvələrini səfərbər etdiyi tək, insan da onunla mübarizədə səfərbər olmalıdır. Əsl çətinliklər qabaqda olduğundan bir addım qabağa getmiş



---

.Sad» surəsi, ayə ۸۲» [۱] -۱

insan arxayınlaşaraq ehtiyatı əldən verməməlidir. Şeytanın son nəfəsədək ondan əl .çəkməyəcəyini bilən insan aqibətindən qorxmalıdır

İmam Sadiq (ə) buyurur: «Ey Əbdullah, şeytan bu aldadıcı dünyada öz tələlərini qurub. Onun bu işdə bizim dostları tələyə salmaqdan başqa məqsədi yoxdur». Əbdullah .İmamın (ə) xüsusi dostlarından olduğu üçün imam mətləbləri geniş şərh etmir

## ƏHLİ–BEYT DOSTLARININ XÜSUSİYYƏTLƏRİ

;Axirət sevgisi .۱

Sonra İmam (ə) öz dostlarının xüsusiyyətlərini şərh etməklə şeytanın hədəfə aldığı insanları tanıtdırır. Onların xüsusiyyətləri sadalanır. İlk xüsusiyyət budur: «Axirət onların nəzərində o qədər əzəmətlidir ki, onu heç vəchlə heç nəyə dəyişməzlər». Hansısa bir məqamda ya dünya, ya da axirəti seçmək zərurəti yaransa, onlar .tərəddüd etmədən axirətə üstünlük verərlər

;Nurla dolu qəlb .۲

Onların qəlbi necə də nurludur!» Bu tə'birlə tanışlığımız Əhli-beyt maarifi ilə» tanışlığımızdan asılıdır. İnsanın batini, onun qəlb və ruhu müxtəlif şeylərin saxlandığı sandıqça kimidir. Hisslərdə qüvvələr toplandığı kimi, bu sandıqçada da qüvvələr toplanmışdır. Hiss aləmi böyük və tanınmış qüvvələrin səhnəsi olduğu tək, insan qəlbi də mə'nəvi qüvvələrin səhnəsi, sığınacağıdır. Bu mə'nəvi nuraniyyət Allahın insana lütfüdür. Hər bir insan öz qəlbini nurlandırmaq ləyaqəti qazana bilər. Nurla dolu qəlbin əlaməti dünyaya və dünyanın bər-bəzəyinə rəğbətsizlikdir. Nurlu qəlbin

bütün diqqəti mə’nəviyyat və axirətə yönəlmişdir. Əksinə, dünya həyatına könül verənlərin batini qaranlıq, gözləri həqiqətə qarşı kordur. Belələri dünyanın aldadıcı .görkəminə aldanır

;Dünyapərəstlikdən çəkinmə .۳

Dünyanı onları aldatmaq intizarında olan təhlükəli bir ilan kimi bilərlər». Zəhərli səhra» ilanları digər canlıları aldatmaq üçün quyruqları üstə dik qalxarlar. İmam Sadiq (ə) dünyanı yol üstə dayanmış təhlükəli bir ilana bənzədir. «Dünya söz anlamayan düşmən kimidir». Dünya Əhli-beyt dostlarının nəzərində söz anlamayan məntiqsiz düşmən .mislindədir; tovlayıb hakim olduğu insana rəhm etməz

.Allahla ünsiyyət .۴

Onların ünsiyyəti Allahladır». Ünsiyyəti yalnız maddi istəklərlə olan dünyapərəstlərin» ziddinə olaraq, Əhli-beyt dostları Allahla ünsiyyətdədirlər. Dünyapərəstlər üçün xəlvət bir otaqda iki rək’ət namaz qılmaq zindanda cəlladın işgəncəsinə mə’ruz qalmaq qədər ağırdır. Amma Allah dostları biganələrdən uzaq bir guşədə əsl məhbubla ünsiyyət intizarındadırlar. Onlar namaz vaxtını, gecə namazının vaxtını həsrətlə gözlər, .Allahla raz-niyazdan böyük ləzzət alarlar

Mütrüblərin, eyş-işrət əhlinin ünsiyyətdə olduğu şeylərdən qorxarlar. Həqiqi dost» onlardır. Onlar həmin adamlardır ki, Allah onların vasitəsi ilə hər bir fitnəni aradan .«qaldırıb, hər bir bəlanı cəmiyyətdən uzaqlaşdırar

Qur’an və Əhli-beyt dilində «fitnə» sözü daha çox mə’nəvi, e’tiqadi, fikri nifaqa aiddir. (İmam (ə

cəmiyyətdəki fikir və əqidə çaşqınlıqlarının Əhli-beyt dostları tərəfindən aradan .qaldırıldığına işarə edir

İmam Sadiqin (ə) yuxarıdakı buyuruqlarından aydın oldu ki, Allahı tanıma və Onunla yaxınlıq, yalnız Əhli-beyt vilayəti sayəsindədir. Əhli-beyt vilayətinə malik olanların ilkin nişanəsi dünyaya e'tinasızlıqdır. Diqqətli olmaq lazımdır ki, dünyaya e'tinasızlıq bir küncdə oturub vəzifəyə əməl etmək deyil. Hər bir insanın vacib dünyəvi vəzifələri vardır. Məsələn, ruzi qazanmaq. Ruzi qazanmaq dünyapərəstlik deyil. İnsanın günün hər saatına uyğun bir vəzifəsi vardır. İnsan dünyaya aldanmadan öz vəzifəsini icra etməlidir. Həqiqi Əhli-beyt dostlarının nəzərində dünya kiçik, axirət isə böyükdür. .İnsanlıq dünya işlərinə aldanmaqda yox, Allaha ibadətdədir

Biz Əhli-beyt yolunu getməklə səadətlə bədbəxtliyi fərqləndirə bilirik. Gözümüzə kiçik görünən bəʼzi biliklər çoxları üçün əlçatmazdır. Əhli-beyt sayəsində asanlıqla nəsibimiz olmuş bu dəyərli biliklərə çox vaxt əhəmiyyət vermədən səadət yolunu başqa yerdə axtarırıq. Xoşbəxtliyimiz üçün zəruri biliklər ixtiyarımızda olduğu halda, eʼtibarlı mənbələrdə adı çəkilməmiş şeylərdə səadət axtarırıq. Əsl səadət yolu isə Qurʼan və Əhli-beyt buyuruqlarında göstərilmişdir. Allah-təala öz bəndələrini ilahi yaxınlığa çatdırmaq istəyir. Ona görə də, əcib-qərib yollara uymadan ilahi göstərişlərə !əhəmiyyət verməyimiz lazımdır

## NƏFSİN HESABI

Nəfsin hesabı rəvayətlərdə təʼkid olunmuş və əxlaq alimlərinin böyük diqqət ayırdığı bir məsələdir. Haqqında danışacağımız rəvayətdə də təʼkid olunur ki, hər kəs öz əməllərini qiymətləndirməli, ən azı gündə bir dəfə əməllərinin hesabını aparmalıdır. Bu iş üçün ən münasib vaxt gecədir. Yatmazdan qabaq gün ərzində görülən işlərin düzgün olub-olmaması barədə düşünmək zəruridir. Buraxılmış səhvləri eʼtiraf edib, .onların nəticəsini aradan qaldırmaq barədə tədbir görülməlidir

İmam Sadiq (ə) Əbdullah ibn Cündəbə buyurur: «Ey Cündəb oğlu Əbdullah, bizi tanıyanlara vacibdir ki, hər gündüz və gecədə əməllərinə nəzər salıb özləri ilə hesab

çəksinlər. Gördükləri yaxşı işləri artırıb, çirkin işlərə görə bağışlanma tələb etsinlər ki, qiyamətdə rüsvay olmasınlar».

## İNSANI HESABA VADAR EDƏN AMİL

Əhli-beyti tanıyan hər bir müsəlman öz həyat proqramını onların göstərişlərinə uyğunlaşdırmalı və əməllərinə nəzər salmalıdır. İnsanın öz əməllərinə nəzər salması Allahın onun ruhuna əta etdiyi bir xüsusiyyətdir. Bu, dünya filosoflarını heyrətə gətirmiş bir xüsusiyyətdir. Adətən, başqalarını qiymətləndirmək imkanına malik olan insan üçün öz daxilinə də nəzər salmaq səciyyəvidir. Özünütanıma mövzusunda mütaliəsi olan insanlar yaxşı bilirlər ki, insanda özünü həvəsləndirmək, tənbeh etmək, danlamaq kimi xüsusiyyətlər vardır. Bütün bunlar Allahın insana böyük mərhəmətidir. Elə bu səbəblərdən də insandan hər gün heç olmazsa bir dəfə əməllərini araşdırmaq tələb olunur.

Özü ilə hesab çəkən insan yaxşı bir əməllə rastlaşdıqda bunu Allahın lütfü bilməli və yaxşı əməlləri artırmaq üçün Ondan yardım istəməlidir. Başqa bir rəvayətə əsasən, insan öz yaxşı əməlinə görə Allaha şükr etməli və gələcəkdə daha çox yaxşı iş görmək üçün Ondan yardım diləməli, pis işlərinə görə tövbə etməlidir. Amma tövbənin şərtləri vardır. Məsələn, qılınmamış namazın qəzasını qılmaq, vurulmuş zərəri ödəmək və s. Belə bir hərəkət növbəti dəfə günahın ruha sirayət etməsinin qarşısını alır. Aydındır ki, qiyamət günü ötən nöqsanların nəticələrini aradan qaldırmaq qeyri-mümkündür. İmam (ə) qiyamət gününün rüsvayçılığını xatırladaraq hələ imkan varkən nöqsanları aradan qaldırmağa çağırır.

İnsan bir işin faydalı və ya dəyərli olduğunu dərk etməsə ona konkret münasibət göstərmir. Ona görə də hər hansı bir xəbərdarlıq olduqca faydalıdır. İnsanın bir işi görməsi üçün məsləhət olduqca faydalıdır. Hər hansı bir işin pis nəticəsindən qorxu həmin işə başlamağın qarşısını alır. Müəyyən bir proqrama əməl etmək üçün də onun faydaları nəzərə alınmalıdır. Bu faydalar insanı həvəsləndirir. Bu məsələyə diqqətsizlik .nəticəsində insan tənbəlləşir

İnsan üçün olduqca ağrılı olan peşmançılığın qarşısını almaq məqsədi ilə yubanmadan özümüzlə hesab çəkməliyik. Qiyamət gününün adlarından biri «yəvmül-həsrət», yə´ni «həsrət günü»dür. Bu ad peşmançılığın ruhən ağrılı olmasına bir işarədir. Qiyamət gününün başqa bir adı isə «yəvmül-hisab», yə´ni «hesab günü»dür. İnsan nə zamansa bütün xeyir və şər əməllərinin hesaba çəkiləcəyinə əmin və diqqətli olmasa çirkin işlərdən uzaqlaşmağa çalışmaz. Amma qarşılaşacağı sorğunun ciddiliyinə inansa xırda nöqsanlara belə yol verməz. Qur'ani-Kərimdə də təsdiq olunur ki, qiyamət əzabının səbəbi insanların həmin günü unutmasıdır. Məhz bu unutqanlıq səbəbindən insan əbədi əzaba düçar olur. Qur'ani-Kərimin «Sad» surəsinin ۲۶-cı ayəsində oxuyuruq: «Şübhəsiz ki, Allah yolundan azanları hesab gününü unutduqları üçün şiddətli bir əzab .«gözləyir

Qur'ani-Kərimdə biri həddi aşmış, digəri isə öz əməllərinə diqqətli olan iki qardaş haqqında danışılır. Mö'min qardaşının nəsihətlərini qulaqardına vuran təkəbbürlü qardaş deyir: «Qiyamətin qopacağını təsəvvür etmirəm. Hətta Rəbbimin hüzuruna

qaytarılsam özümə bundan da yaxşı məskən taparam»(١). Qur’an bu hekayəti nəql etməklə hesab-kitabsız e’tiqadın heç bir fayda verməyəcəyini anladır. Qiyamət hesabına inam axirət inamının əsasıdır. Qiyamət gününün hikməti insanların öz yaxşı və pis əməllərinin mükafat və cəzasına çatmasıdır. Hesab olmasaydı, qiyamət nəyə lazım idi?! Həzrət Peyğəmbər (s) buyurur: «Nə qədər ki, hesaba çəkilməmisiniz özünüz özünüzü hesaba çəkin»(٢). Belə bir inama malik olan insan hökmən öz əməllərini .nəzərdən keçirib nəticə çıxarır

## HESABIN MƏRHƏLƏLƏRİ

Nəfsin hesabı o qədər mühüm məsələdir ki, bu mövzuya kitablar həsr edilmişdir. Bu barədə kifayət qədər ayə və rəvayətlər mövcuddur. Əxlaq kitablarında verilmiş göstərişlər insanların bu sahədə təkamülü üçün olduqca faydalıdır. Nəfsin hesabı üçün .dörd mərhələ müəyyənləşdirilmişdir: müşaritə, müraqibə, mühasibə və müatibə

Birinci mərtəbədə insan özü ilə şərt kəsir ki, bu gün vəzifələrini tam yerinə yetrəcək və günahlardan çəkinəcəkdir. İkinci mərhələdə insan verdiyi əhdləri pozmamaq üçün bütün əməllərini nəzarət altına alır. Üçüncü mərhələ günün sonunda bütün əməllərin hesab-kitabından ibarətdir. Dördüncü mərhələdə insan buraxdığı nöqsanlara görə özünü tənbeh edir və bunun üçün müəyyən işlər görür. Məsələn, növbəti gün ya oruc tutmağı, ya sədəqə verməyi, ya Qur’an oxumağı, ya da başqa bir xeyirli işi özünə .vacib edir



---

.Kəhf» surəsi, ayə ٣۶» [٢] -١

.Biharul-ənvar», cild ٧٠ » [٣] -٢

Bu mərhələlərin ən əhəmiyyətlisi mühasibədir. Əgər insan öz yaxşı və pis əmələrini tam dəqiqliklə qiymətləndirməyə müvəffəq olarsa, Allahın yardımı ilə nöqsanları aradan qaldırmağa da müvəffəq olar.

### Bə'Zİ MÜHÜM NÖQTƏLƏR

١. Günahdan çəkinmək. İnsan günah barədə dərindən düşünməli və onun mahiyyətini dərindən dərk etməlidir. E'tiqadımıza əsasən Allah bizi yaratmış, yaxşı və pis yolu tanıtdırmaqla hansını seçməyi öz ixtiyarımızda qoymuşdur. İnanırıq ki, bu dünyadan sonra başqa bir aləm də var və orada insan yaxşı əməllərinin mükafatını və pis əməllərinin cəzasını alacaqdır. Bu inam səbəbindən insan öz ömür sərmayəsindən lazımınca istifadə etməlidir. Biz bu dünyaya imtahan olunmaq, özünütərbiyə mərhələlərini keçib, kamilliyə çatmaq üçün gəlmişik. Ömrün nəticəsi əbədi behişt və ya cəhənnəmdir.

İnsanın dünya həyatı körpənin ana bətnindəki həyatına bənzəyir. Körpə ana bətnində doqquz ay qalmaqla dünya həyatına hazırlaşdığı kimi, bizim də bu qısa dünya həyatımız əbədi bir həyat üçün hazırlıqdır. Sadəcə, ana bətnindəki körpədən fərqli olaraq, bizim dünyadakı təkamülümüz özümüzdən asılıdır. Eləcə də, körpənin gələcəyi dünya həyatı öz müddətinə görə bizim gedəcəyimiz axirət həyatı ilə müqayisə oluna bilməz.

Din dünyanı özünütərbiyə məkanı kimi tanıtdırır. İnsan bu məkanda əbədi həyat üçün hazırlıq görməlidir. Dünya həyatına bu nöqteyi-nəzərdən baxanlar hər dəqiqəsini gələcək axirət dünyası üçün faydalı bilirlər. İstənilən hər hansı başqa bir nəzər və ya fəaliyyətsizlik əbədi bədbəxtliklə nəticələnir.

Nöqsanları aradan qaldırmaq barədə düşünək. Müamilədən qazanc götürməmək, müamilədə zərərə düşməkdən fərqlənir. Birinci halda sərmayə yerindədirsə, ikinci halda sərmayə əldən çıxmışdır. Günah ikinci müamilənin oxşarıdır. Ömrünü əldən verib ..!əbədi əzaba düçar olmaq

Günahların kəmiyyətinə diqqət. Günahın çirkinliyini anlamış insan yol verdiyi . ٢ günahları kəmiyyət cəhətdən hesablayıb onların nəticəsini aradan qaldırmaq üçün çalışmalıdır. Çıxış yolu günahı inkar edib unutmaq yox, Allah qarşısında e'tiraf etməkdir. Günahkar insan gün uzunu neçə dəfə qeybət etdiyini, neçə dəfə yalan danışdığını və başqa neçə günaha yol verdiyini dəqiq hesablaya bilməsə də günün neçə saatını günaha sərf etdiyini düşünüb saatlardan ibarət olan ömrün puça .çıxmasından peşman olmalıdır

Günahların keyfiyyətinə diqqət. Günahlar keyfiyyətinə görə müxtəlifdir. Elə günah .٣ var ki, ona bir dəfə yol vermək yetmiş il başqa bir günaha yol verməyə bərabərdir. Günahın böyük-kiçikliyinə diqqət vermək zəruridir. Məsələn, bir çox rəvayətlərdə qeybət olduqca çirkin günah kimi təqdim olunur. Bunu da qeyd edək ki, günahı kiçik hesab etməklə onu davam etdirməyin özü böyük günah hesab olunur. Şeytanın .hiylələrindən biri günahı insana kiçik göstərməkdir

Vacib buyuruqların icrası. İnsan diqqətli olmalıdır ki, Allahın vacib buyuruqlarını . ۴ nəzərdən qaçırmasın. Namaz qılıb, oruc tutan oxucu «biz ki, vacibata əməl edirik» düşünərək arxayınlaşmasın. Bu arxayınlıq şeytandandır. Adətən, hər birimiz hansısa vacib bir buyuruğu nəzərdən qaçırırıq. Hətta daim fiqh, Qur'an və

rəvayətlə məşğul olan şəxslər də hansısa vəzifəsindən qəflətdə qalır. Valideynə yaxşılıq, qohum-əqrəbaya baş çəkmək, mö'minin istəyini yerinə yetirmək və bir çox başqa vacib buyuruqların unudulması imanlı insan üçün böyük bəladır. İctimai və siyasi .vəzifələr də nəzərə alınsa vəziyyət bir qədər də mürəkkəbləşər

Vacib dini vəzifələri nəzərdən qaçırmamaq üçün proqramlı bir həyat yaşamaq, vacib .göstərişlərin yazılı qeydiyyatını aparmaq olduqca faydalıdır

Əməlin düzgün icrasına diqqət. Hər bir əməlin qəbulu üçün onun düzgün icra . ۵ edilməsi şərtdir. Bə'zən insan müəyyən bir vəzifəni yerinə yetirdiyi üçün xoşhal olsa da, həmin əməlin düzgün icrasına diqqətsizlik göstərir. Elə də olur ki, insan yerinə yetirdiyi vəzifəsinin ardınca elə bir iş görür ki, əvvəlki iş puça çıxır. Məsələn, namaz qılmaq vacib vəzifədir. Bə'zən insan namaz qıldığı və cəmiyyət namazında iştirak etdiyi üçün sevindiyi halda düşünmür ki, bu namaz qəbul dərəcəsinə çatıb, yoxsa yox. Namazda riyaya yol verilibmi? Təkəbbür göstərməklə onu puça çıxarmamışdırmı? ...?Minnət qoyduğumuz üçün verdiyimiz yardım hədər getməyibmi

.Bəli, əməlin qəbul olma şərtlərinə diqqət göstərmək lazımdır

Ötən söhbətdən belə bir nəticəyə gəldik ki, Əhli-beyt məktəbinə bağlanmayan şəxs İslamı tanımaq imkanında deyil. Bu məktəbə bağlananlar isə gündəlik əməllərinin hesab-kitabını aparmalı, buraxılmış nöqsanların nəticələrini aradan qaldırmaq üçün .müəyyən tədbirlər görməlidirlər

İnsan etdiyi əməllərə görə hansı nəticə ilə üzləşəcəyini bilmək üçün bu başdan əməllərini düzgün qiymətləndirməlidir. Gün uzunu pul-parasını hesablayan insan əməllərini də hesablamaq üçün vaxt ayırmalıdır. Ticarətlə məşğul olan hər bir şəxs daim qazancını hesablayır. Bə'zən isə hesab-kitabdan aydın olur ki, nəinki qazanc yoxdur, hətta sərmayə də əldən çıxmışdır. Belə də ola bilər ki, sərmayəsini verib aldığı .şey insanın cisminə, ruhuna, ailəsinə zərər vurub, üstəlik, rüsvayçılıq da gətirsin

Amma alış-verişdə hesab-kitaba riayət edən tacirlər zərərdən qaçmaqla yanaşı daha artıq qazanc əldə etmək üçün çalışırlar. Belə tacirlər heç vaxt ۱۰۰۰ dinar qazancı qoyub .۹۹۹ dinar qazanc ardınca getməzlər

İnsanın dini vəzifələrinin icrası da belədir. Bə'zən insan elə günah əmələ yol verir ki, dünya və axirətdə rüsvay olur. Əsl tacir nəinki müamiləsindəki zərərdən, hətta qazanc almamasından da narahatdır. Günah əməl müamilədə zərərə uyğundursa, bəs qazancsız müamilənin oxşarı hansı əməldir? Bu sayaq faydasız əməllər İslamda «ləğv» adlanır. Qur'ani-Kərimin

Mu'minun» surəsinin ۳-cü ayəsində oxuyuruq: «Mö'minlər o kəslərdir ki, ləğv» (faydasız) işlərdən çəkinərlər». Axı qazanmaq imkanı olan insan nə üçün zərər .«!?etməlidir

Bə'zi tacirlər, hətta gecə də narahat yatırlar ki, görəsən sabahkı alverin qazancı nə qədər olacaq, mal eyibli çıxacaqmı? İnsan əməllərinə də belə yanaşmalıdır. Haram olub-olmadığı bilinməyən və ya şübhə doğuran əməllərdən çəkinməli, etdiyi .əməllərdən nigaran qalmalıdır

Bir halda ki, heç bir insan yaxşı malı qoyub şübhəli mala sahib durmur. Nə üçün halal işlər dura-dura haram və ya şübhəli əməllərə yol verməliyik?! Şübhəsiz ki, faydasız və ikrah doğuran işlərə sərf etdiyimiz ömrün üzücü peşmançılığı vardır. Ömrün qədrini .bilən insan yalnız səmərəli işlərlə məşğul olmalıdır

## ÖVLİYALARIN İBADƏTƏ BAXIŞI

İmanın aşağı mərtəbəsində olan bəndələr vacib əməllərin icrası və haramlardan çəkinmək üçün Allahdan yardım istəməlidirlər. Amma elə bəndələr də vardır ki, onlar bu məsələdə daha dərin baxışa malikdirlər. Onların hesabı da adi insanların hesabından fərqlənir. Onlar harama qətiyyən yol vermir, təsadüfən şübhəli məsələlərdə büdrəyirlər. Haramdan uzaq olan bu insanlar mə'nasız, ləğv işlərinə görə .narahat olurlar. Belələri axirətləri üçün faydasız işlərdən kənarlaşmağa çalışırlar

Biz elə düşünürük ki, vacib və müstəhəb (bəyənilmiş) əməllər məhduddur və əksər əməlimiz mübah (nə vacib, nə haram, nə müstəhəb, nə də məkruh olmayan adi ,əməllər, məsələn, nəfəs almaq) sinfinə aiddir. Hansı ki

bu əməllər də hansısa bir baxımdan ikinci dərəcəli vacib ola bilər. Bu ikinci dərəcəli vacibləri də nəzərə alsaq, ümumən vacib işlərin icrası üçün ömrümüz azlıq edər. Məsələn, öz ətrafındakıların suallarını cavablandırmaq üçün ruhaniyə ۲۴ saat azlıq edə bilər. İndi özünüz müəyyənləşdirin ki, bəşəriyyəti Əhli-beyt maarifi ilə tanış etmək üçün nə qədər vaxt lazımdır. «Nisa» surəsinin ۵۸-ci ayəsində buyurulur: «Allah sizə əmr edir ki, əmanətləri sahiblərinə qaytarasınız». Əhli-beyt maarifi ruhanilərin əlində əmanətdir. Bu əmanətin sahibi isə bəşəriyyətdir. Ruhanilər yalnız bu vəzifələrinə lazımı diqqət göstərsələr, heç bir müstəhəb işə vaxt qalmaz. Diqqətli, dərin baxışa malik insanlar vacib və müstəhəb olmayan işə görə tövbə edirlər. Çünki Allah vaxtını boş keçirənləri sevmir. Bu insanlar günün sonunda haram iş görmədiklərini nəzərə alıb rahatlandıqları kimi, boş keçirdikləri vaxta görə də təəssüf edirlər. Onlar nəyə baxdıqlarını, nə danışdıqlarını, nə eşitdiklərini bir-bir xatırlayaraq əməllərində nöqsan .axtarırlar. Faydasına əmin olmadıqları hər bir iş onlara sıxıntı gətirir

## ?HANSI NAMAZA TÖVBƏ DÜŞÜR

Söhbətimizin bu hissəsinə qədər qeyd etdiyimiz sifətlərdən üstünləri də vardır. Bizim ibadət bilib könül verdiyimiz işləri özü üçün günah hesab edənlər də var. Yaxşı əməllər sırasında birinci yerdə duran namaz haqında buyurulur: «Namaz dinin sütunudur»(۱) Görən bu sifət bütün namazlaramı şamildir? Övliyalar diqqət və səmimiyyətlə qılınmamış namazı özləri üçün günah bilib belə namaza tövbə etmişlər. Günümüz ۲۴ saatdan ibarət



---

.Biharul-ənvar», cild ۸۲» [۴] -۱

İnsanı digər canlılardan fərqləndirən onun diqqətli olmasıdır. Danışana diqqət göstərməyib arxa çevirmək heyvanlara məxsus xüsusiyyətdir. Həzrət Peyğəmbər (s) buyurur: «Namaz zamanı Allahdan qeyrisini düşünən kəs heyvana çevrilməkdən qorxmurmu?»(۱). Uca məqam sahibləri olanlar ibadət zamanı diqqətli olar, fikirlərini Allaha yönəldərlər. «Namaz, dua, Qur'ana məşğul olarkən fikrim haradaydı» deyə .düşünər, hər zaman nöqsana yol verdikləri üçün tövbə edərlər

Əlbəttə ki, çoxlarının səviyyəsi deyiləndən aşağıdır. İnsanın övliyalar haqqında düşünməsi onu öz nöqsanlı ibadətinə görə xəcalət çəkməyə vadar edir. Bir dəfə iki rək'ət gecə namazı qılmaqla insan necə qüdrətlənə bilər?! Övliyalar günaha yox, naqis ibadətə xatir tövbə edirlərsə, günahkarlar nə üçün tövbə etməməlidirlər?! Övliyalara bənzəmək üçün Allahdan yardım istəyək. Əhli-beyt yolunu getmək onlara oxşamaq üçün çalışmaq deməkdir. Həzrət Əli (ə) buyurur: «Ali məqama qüdrətiniz olmasa



---

.Biharul-ənvar», cild ۸۴» [۵] -۱

.(da, haramdan çəkinməyinizlə, özünüzə nəzarətlə bizə yaxınlaşın»(١)

Onlara oxşamağa çalışaq! Əhli-beytin varlığından xəbərdar olan insan Əhli-beyt .ruhiyyəsini dadmaq üçün Allahdan yardım istəməlidir

Nəfsin hesab mərtəbələrindən biri Allahdan qeyrisini düşünməyin günah hesab olunmasıdır. Hər halda, övliyalar belədir. Günahkarlar üçünsə namazda Allahdan .qeyrisini düşünmək də bir günahdır

Əlbəttə ki, övliyalar üçün də dərəcələr vardır. Hətta peyğəmbərlər də eyni bir dərəcədə deyildir. «Bəqərə» surəsinin ٢٥٣-cü ayəsində buyurulur: «Bə'zi peyğəmbərləri o birilərindən üstün etdik». Həmişə özünü Allah hüzurunda hiss edən övliyalar Ona diqqətsizliyi günah hesab edirlər. Biz isə elə güman edirik ki, yalnız namaz vaxtı Allahın hüzurunda oluruq. Başqa vaxtlarda isə ev, iş, dərs, övlad haqqında düşünürük. Namazdan başqa vaxtlarda düşünmək fikrimiz də olmur. Mərhum İmam isə «aləm Allahın hüzurudur» buyurardı. Qur'ani-Kərimdə belə düşünən övliyalar haqqında buyurulur: «Heç bir müamilə və ticarət onları Allahın zikrindən ayırmaz». Bu çox ali bir .məqamdır. Hətta dərs gedişində Allahın zikrindən ayrılmayan ruhanilər vardır

### ÖVLİYALARIN ALLAHA SIX BAĞLILIĞI

Belə bir bağlılıq mümkündürmü? Mümkündür, bunu təsəvvür etmək çox çətindir. Amma bacarmadığın işi qeyri-insani-mümkün hesab etmək məntiqə sığmır. Allahdan elm öyrənmək üçün Onu düşünməyi yol hesab



---

.Nəhcül-bəlağə», ٤٥-ci məktub» [۶] -١

edən adam bu düşüncədən ayrıla bilərmi? Özünü Allah hüzurunda bilən adam Ondan qəflətdə qala bilərmi? Belə insan danışdığı sözlərdə Allahın razılığını gözləyir. Bəli, belə bəndələr vardır. Onları tanımamağımız onların yoxluğuna dəlalət etmir. Məhz onların varlığı səbəbindən yer üzü mərhəmətə bürünmüşdür. Həyatın davamı üçün həqiqi .Əhli-beyt aşiqlərinin varlığı mühüm şərtdir

Öz əzizini əldən vermiş adamın fikri daim onun yanındadır. Belə bir itkiyə mə'ruz qalmış insan hər hansı bir işlə məşğul olsa da əzizinin fikrindən ayrıla bilmir. Allahı tanıyıb, Onun camal və cəlal sifətlərindən xəbərdar olanlar üçün Allahdan əzizi, Allahdan yaxını yoxdur. Əgər məhəbbət varsa daim məhbub haqqında düşünmək təbii bir haldır. «Bəqərə» surəsinin ۱۶۵-ci ayəsində oxuyuruq: «İman gətirənlərin Allaha .«məhəbbəti daha qüvvətlidir

Allahdan diləmək, Əhli-beyt göstərişlərindən istifadə etmək və onlara bağlanmaqla qəlbimizi Allahın mə'rifət və məhəbbət nuru ilə işıqlandıra bilərik. Əgər belə bir səadət nəsibimiz olsa və qəlbimizdə Allaha məhəbbət yaransa Onu daim xatırlamaq da çətin .olmaz

## ŞEYX ƏNSARİDƏN BİR XATİRƏ

Allahın həqiqətən Onu sevən bəndələri vardır. Onlar bu sevgini heç nə ilə dəyişməzlər. .Belələri Allahla ünsiyyət üçün fürsət axtarırlar

Mərhum Şeyx Ənsari haqqında bu mövzuda söhbətlər çoxdur. İsti bir yay günü mənzilə daxil olan Şeyx su istəyir. Şeyx üçün zirzəmidən sərin su gətirməyə gedirlər. Şeyx su gələnədək iki rək'ət namaz qılmaq qərarına gəlir. O namaza başlayandan sonra suyu gətirib yanına qoyurlar. Nəcəfin ۵۰ dərəcə istisini, Şeyxin yorğunluğunu

və qarşısındakı sərin suyu təsəvvür edin. O isə suyu gözləmək əvəzində namaza başlayır və namazda Qur’anın uzun surələrindən birini oxuyur. Namazı bitirib artıq .istisi dodaq yandıran sudan bir qurtum içib ayağa qalxır

Bəli! Şeyx Ənsari kimilər öz məhbubları ilə görüş üçün fürsət axtarır və namazdan feyz alırlar. Susuzluğu unutduran bir ləzzət! Bütün bunlar həqiqətdir, Allahla ünsiyyətdən !faydalanmış böyük insanlar haqqında həqiqət

Əslində risalələri və «Məkasib»i ilə tanış olduğumuz Şeyx Ənsarinin mə’nəvi aləmindən bir o qədər də xəbərdar deyilik. Belə bir mə’nəviyyatdan pay almaq üçün Allaha dua edək. Belə olsa ömrümüzün qədrini bilər, Əhli-beyt yolu ilə Allaha yaxınlaşar və onların .şəfaətinə nail olarıq

Əgər həzrət Peyğəmbər (s) və Əhli-beyt (ə) buyuruqlarına diqqətlə nəzər salsaq aydın olar ki, axirətə diqqət və dünyaya vurğunluqdan çəkinmək olduqca mühüm məsələlərdir. Bu da qeyd olunmalıdır ki, Əhli-beytə məxsus bütün tə'limlər və bu şəxsiyyətlərin bütün buyuruqları Qur'ani-Kərimdən əxz olunmuşdur. Başqa sözlə, bu şəxslər bir növ danışan Qur'andırlar. Onların həyatına yaxşı nəzər saldıqda hər an Qur'an məntiqləri ilə qarşılaşırıq. Əhli-beyt buyuruqlarının özündə təsdiqlənir ki, bu buyuruqlar Qur'andandır. Eləcə də bildirilir ki, Əhli-beytin (ə) başqalarından üstünlüyü .Qur'andan hamının dərk etmədiyi mə'naların onlar tərəfindən dərk olunmasıdır

Qur'ani-Kərimin tə'kid etdiyi məsələlərdən biri dünyanın müvəqqəti və e'tibarsız olmasıdır. Qur'an dünyanı insanın kamillik yolunda maneə bilərək axirəti üstün tutur. Hətta dünyaya vurğunluq küfr sırasında təqdim olunur. «İbrahim» surəsinin ٢-٣-cü ayələrində buyurulur: «Düçar olacaqları şiddətli əzabdan ötrü vay kafirlərin halına! O kəslər ki, dünyanı axirətdən üstün tuturlar». Ayəyə əsasən kafirlər dünyanı axirətdən üstün tutan şəxslərdir. Onlar dünyanın ötəri ləzzətlərini əbədi axirət səadətindən .üstün tuturlar

İmam Sadiq (ə) Qur'ani-Kərim şivəsi ilə Əbdullah ibn Cündəbə buyurur: «Xoş o insanın halına ki, kafirlərə verilmiş dünya malına baxanda həsrət çəkmir! Xoş axirəti seçib, bu yolda çalışanın halına! Xoş yalan arzulara aldanmayanın halına!» Bu rəvayət «Taha» -surəsinin ١٣١

ci ayəsini xatırladır: «Kafirlərin bə’zi zümrələrini sınamaq üçün onlara dünya həyatının zinəti olaraq verdiyimiz var-dövlətə həsrətlə baxma». Əlbəttə ki, bu ayədə zahirən .peyğəmbərə müraciət olunsa da göstəriş hamıya şamildir

Təbii ki, gözləri açıq insan yolda və ya işdə təsadüfən başqalarının mülkünü görə bilər. Bu baxış ötəridir. Amma bə’zən insan gördüyü səhnənin tə’siri altına düşür. Ayədə .məhz bu başqalarına verilmiş dünya malına göz dikməmək tapşırılır

İnsanlar malik olduqları dünya malının miqdarına görə fərqlənirlər. Bu fərqlərin məntiqi əsasları vardır. Başqalarının gözəl mülkə, qiymətli avtomobilə, dəniz kənarında bağa malik olduğunu görməklə həsrət çəkən insan bu ne’mətləri əldə etmək həvəsinə düşür. Əvvəlcə halal yolla çalışır. Müvəffəq olmadıqda qaranlıq yollara da baş vurur. Bu yolla da arzusuna çatmayanlar harama əl atır. Var-dövlət qazanmaq üçün borc götürür. Borcu ödəmək üçün sələmə razı olur və nəticədə harama düşür. Çoxları da bu .yolla məhv olublar; əllərindəki halal sərvəti itirərək zəlalət uçurumuna yuvarlanıblar

Belə bir pis aqibətlə üzləşmək istəməyən insan əvvəlcədən günahın qarşısını almalı, başqalarının var-dövlətinə göz dikib həsrət çəkməməlidir. Dünya malı şirin olsa da .insanın ona vurğunluğu əbədi axirət həyatından məhrum olmaqla nəticələnir

### SOSİAL BƏRABƏRSİZLİKLƏRİN FƏLSƏFƏSİ

Nə üçün insanların bir qismi dövlətli, digər bir qismi isə kasıbdır? Əvvəla var-dövlətin çoxluğu Allahla dostluq

yox, imtahan əlamətidir. «Ənfal» surəsinin ٢٨-ci ayəsində buyurulur: «Bilin ki, var-dövlət və övlad sizin üçün yalnız bir imtahandır». Başqa bir ayədə oxuyuruq: «Biz sizi xeyir və şərlə sınağa çəkərik»(١). Dilimizə sınaq mə'nasında tərcümə olunmuş sözə Qur'anda «fitnə» kimi işarə olunub. Ayələrdə var-dövlət fitnə, başqa sözlə, sınaq kimi tanıtdırılır. İnsan var-dövlət qazanıb onu sərf edərkən ilahi göstərişlərə əməl edə biləcəkmi? Bir halda ki, dünya imtahandır, ona vurulmağa dəyərmi?! Əlbəttə ki, dünya son məqsəd olsaydı onun haqqında düşünməyə dəyərdi. Bir halda ki, dünyanın ömrü imtahan bitənədəkdir, ona könül verməyə də dəyməz. Dünya, üzərində suallar yazılmış imtahan vərəqi kimidir. Bu kağızın gözəl olub-olmamasının əsl məqsədə heç bir dəxli .yoxdur. Əsl məqsəd suallara düzgün cavab yazmaqdır

Yuxarıda qeyd olunan bərabərsizliyin ikinci səbəbi budur ki, dünya ne'mətləri Allah nəzərində biz düşünmədiyimiz kimi dəyərli deyil. Qur'ani-Kərimin bir çox ayələrində dünya ne'mətləri axirət ne'mətləri ilə müqayisə olunur və təbii ki, axirət ne'mətlərinə üstünlük verilir. «Axirət ruzisi daha xeyirlidir» buyurulur. İnsana dünya ne'mətlərinə uymayıb axirət ne'mətləri haqqında düşünmək tapşırılır. Bəli, əsl ruzi olan, yə'ni «Allah .ruzisi» adlandırılan əbədi axirət ne'mətlərinin ardınca getməyə dəyər



---

.Ənbiya» surəsi, ayə ٣٥» [٧] -١

## AXİRƏT NE'MƏTLƏRİNİN DÜNYA NE'MƏTLƏRİNDƏN ÜSTÜNLÜYÜ

Əlbəttə ki, bütün ne'mətlər, ruzilər Allahdandır. Amma daha üstün şərafətə, dəyərə malik olan şeyləri Allah özünə aid bildirir. Məsələn, yer üzündə olan bütün evlər (məscidlər) Allahındır. Amma Kə'bə evi xüsusilə ona aid edilir. Bu xüsusiyyət «izafeyi-təşrifi», yə´ni «şərafət əlavəsi» adlanır. Başqa bir misal: Bütün canlıların malik olduqları ruh Allahın ətasıdır. Amma Allah-təala yalnız insandakı ruhu öz ruhu adlandırır: «Mən ona surət verib ruhumdan üfürdüyüm zaman, siz ona səcdə edin»(١).

Bütün dünya ne'mətləri insanın imtahanı üçün bir vasitədir. Allah yalnız axirət ne'mətlərini nəzərdə tutduğundan, dünya ne'mətlərini Allah ruzisi adlandıra bilmərik. «Ənfal» surəsinin ۶۷-ci ayəsində buyurulur: «Siz puç dünya malını istəyirsiniz. Allah isə axirəti qazanmağınızı istəyir». Tövbə surəsinin ۵۵-ci ayəsində oxuyuruq: «Münafiqlərin nə malları, nə də övladları səni təəccübləndirməsin. Allah onlarla ancaq münafiqlərə dünya əzabı vermək, kafir olduqları halda canlarını almaq istər». Allah-təala həzrət Peyğəmbərə (s) buyurur ki, dünyapərəstlər üçün birinci əzab var-dövlət toplamaq, sonra isə onu qorumaqdır. Buna görə də həyatın şirinliyini dadmazlar. Öləndə də min bir zəhmətlə toplanmış var-dövlətin əldən çıxdığını görüb iztirab çəkərlər!

Dünyapərəstlər bir ömür zəhmətlə, başqalarına zülm-sitəmlə, insanların haqqına təcavüz etməklə qəpik-qəpik yığdıqları pulu bir dəfəlik əldən verərlər. Allah-təala



---

١- [٨] «Hicr» surəsi, ayə ٢٩.

onların dözülməz narahatçılıqla kafir olaraq öləcəklərini bəyan edir. Belə bir ölüm həmin imtahanın dəhşətli nəticəsidir. Allah bu tə'birlərlə insanı dünyaya vurğunluqdan .çəkindirmək istəyir

Aydın oldu ki, ayə və rəvayətlər insanı dünya bər-bəzəyinə göz dikməməyə çağırır. .İnsan fitrətində dünyaya meylin mövcudluğunun səbəbi barədə sonra danışacağıq

## ?VAR–DÖVLƏT FAYDALI OLA BİLƏRMİ

Dünya malı təkcə kafirlər üçün nəzərdə tutulmayıb. Bə'zi övliyaların da böyük var-dövləti olub ki, bu səviyyə başqaları üçün əlçatmazdır. Cinlər və insanlar, heyvanlar və quşlar da onun ixtiyarında olub. Demək varlı olmaq pis adam olmaq üçün dəlil deyil. Əslində, dünya ne'məti imtahan vasitəsidir. Bu imtahandan bə'ziləri alnıaçıq, bə'ziləri isə başıaşağı çıxır. Allahı unutmayıb var-dövlətdən Onun razılığı üçün istifadə edənlər nicat tapır, nəfsinə uyub şər'i çərçivədən çıxanlar isə zəlalətə düşürlər. Ona görə də axirət yolunda istifadə etmək üçün Allahdan var-dövlət istəməyin heç bir eybi yoxdur. Varlı mö'minlərə din yolunda pul xərclədikləri üçün qibtə etmək nöqsan sayılmır. Həzrəti Xədicənin (ə) İslam yolunda xərclədiyi böyük var-dövlətinə baxıb həsrət .çəkmək olduqca çirkin bir işdir

Allah-təala Qur'ani-Kərimdə zalım varlıların aqibətini işıqlandırır. «Qəsəs» surəsinin ٧۶-cı ayəsində buyurulur: «Həqiqətən Qarun Musa qövmündən idi. O, İsrail oğullarına qarşı həddini aşmışdı. Biz ona açarlarını bir dəstə güclü adamın zorla daşıya biləcəyi xəzinələr vermişdik». Həmin surənin ٧٩-٨٢-ci ayələrində oxuyuruq: «Qarun öz zinət və ehtişamı içində öz

qövmünün qarşısına çıxdı. Dünyaya həris olanlar dedilər: Kaş Qaruna verilən bizə də veriləydi...». Elm verilmiş kəslər isə belə dedilər: «...İman gətirib yaxşı əməl edənlər üçün Allahın mükafatı daha yaxşıdır...». Nəhayət, Qarunu sarayı ilə birlikdə yerə batırdıq... Dünən Qarunun yerində olmaq istəyənlər səhəri gün belə deyirdilər: «...Sən demə, kafirlər nicat tapmayacaqlarmış».

Allah-təala bu hədisləri buyurmaqla var-dövlətə vurulmağın mənfi nəticələrini biz insanların nəzərinə çatdırır. Bəli, halal yolla qazanıb Allah yolunda sərf etmək yaxşı işdir. Amma dünya malına könül verməyə heç bir əsas yoxdur. Dünya malı imtahan səhnəsindəki imtahan vərəqindən başqa heç bir şey deyildir. Əsas məsələ bu vərəqin necəliyi yox, bu vərəqdəki suallara necə cavab verilməkdir.

Şəksiz ki, ictimai həyatda insanlar müxtəlif şəkildə bir-birlərinə qarşılıqlı tə'sir göstərirlər. Ən böyük tə'sir danışığın göstərdiyi tə'sirdir. Bu məsələ psixologiyanın əsas mövzularından olduğu üçün bir neçə cümlə ilə kifayətlənmək qeyri-mümkündür. Amma bir neçə nöqtəni qeyd etmək zəruridir. Danışıq elm və təhsil sahəsində müstəsna rol oynayır. Danışıq müəllim və tələbə arasında rabitə yaradır. Təhsilin əhatə dairəsi olduqca genişdir. Tə'limin müxtəlif formaları vardır və onlardan biri də təbliğdir. Təbliğ mexanizminin insana tə'siri digər tə'lim mexanizmlərinin tə'sirindən az deyildir. Bə'zən insan haradan tə'sirləndiyini hiss etmir. Rəftarında yaranmış dəyişikliklərin öz istəyinə əsasən baş verdiyini təsəvvür edən insan əslində başqa .birinin tə'sirinə mə'ruz qalmışdır

Cəmiyyətdəki ictimai firqələrin insana tə'siri olduqca böyükdür. Adi bir tələbə də bir sinif üçün tə'sirlidir. Amma hər hansı bir ictimai firqə ilə müqayisədə bu tə'sir olduqca kiçikdir. Cazibəli danışıq qabiliyyətinə malik olan tələbə az qala bütöv bir sinifi öz tə'siri altına ala bilir. Onun düşüncə tərzi, rəftarı, geyimi, oturuşu və digər xüsusiyyətləri ətrafındakıların marağına səbəb olur. Geyiminə xüsusi fikir verən tələbə başqalarının da öz geyiminə diqqətli olmasına səbəb olur. Ətrafdakılar geyim məsələsində həmin .tələbəni təqlid etməyə başlayır

səh:۳۶

Bə᾽zən dinləyici danışanın gətirdiyi dəlillərin tə᾽siri altına düşür. Bə᾽zən isə gözəl danışıq dəlillərin tutarsızlığını ört-basdır edir. Danışanın tə᾽siri ۵۰ faiz onun şəxsiyyətindən asılıdır. Beləliklə, rəftar və danışığın tə᾽sirini nəzərə alaraq İslam dini .də᾽vət və təbliğə böyük əhəmiyyət verir

## !DİNLƏYİCİNİN SƏVİYYƏSİNİ NƏZƏRƏ ALIN

Adətən cavanlar eşitdiyini başqalarına danışmaqdan ləzzət alır. Bu çox təbii meyldir və nöqsan sayılmır. Amma bir şeyə diqqət etmək lazımdır ki, dinləyici eşitdiklərini dərk edə bilirmi? Bir çox biliklər əksəriyyət tərəfindən çətin dərk olunduğu üçün hər sözü .hər adama demək düzgün deyildir

Əhli-beyt hədislərinin bir fəsli «kətmani-sirr», yə´ni «sirri gizli saxlama» adlanır. Mö᾽minlərə Əhli-beyt sirlərini qorumaq tapşırılır. Bu nə sirdir? Bə᾽ziləri hansı sirri açdıqları üçün lə᾽nətlənmişlər? Doğrudanmı insan bu sirri açdığı üçün bəlaya düşə bilər? Bu sirlərdən bizə mə᾽lum olanı varmı? Bizim üçün də hansısa sirri gizlətmək ?vacibdir, yoxsa hər bildiyimizi danışa bilərik

İmam Sadiq (ə) Əbdullah ibn Cündəbin nəzərinə çatdırır ki, başqalarını doğru yola də᾽vət edərkən onların səviyyəsini nəzərə almaq lazımdır. Bütün mətləbləri dinləyiciyə birdəfəyə çatdırmaq olmaz. Böyük həcmdə mə᾽lumatı qəbul etmək insana çətin gələ bilər. Eləcə də, tövhid və ya nübüvvət kimi dərin məsələləri hər insan birbaşa dərk etməyə də bilər. Hamıya deyilməsi mümkün olmayan mətləblərdən biri də Əhli-beytin sirridir. Həzrət

Peyğəmbər (s) buyurur: «Əgər Əbuzər Salmanın qəlbindəkindən agah olsaydı onu öldürərdi»(1).

Unutmaq olmaz ki, yüksək iman və mə’rifətə malik olan bu iki şəxs səviyyəcə çox yaxın idi.

Mə’lum olur ki, dilə gəlməyən yüksək bir maarif mövcuddur. Bu maarif sözlə ifadə olunduqda, eşidənlər onu yanlış anlayır. Ona görə də bu barədə danışıldıqda ya danışan küfrdə ittiham olunur, ya eşidən küfrə düşür, ya da hansısa bir pis nəticə alınır.

Bu sayaq çətin başa düşülən mətləbləri yazmaq da problem yaradır. Hər mətləbi hər kitabda yazmaq olmaz. Əks təqdirdə, bu mətləbləri oxuyan insanlar öz səviyyələrinə uyğun başa düşərək yoldan aza bilərlər.

Fəlsəfə və irfanda bəyan olunmuş «vəhdəti-vücud» məsələsi çətin başa düşülən mövzulara nümunə ola bilər. Bu mövzunu oxuyan insanlar adətən onu düzgün anlamır və arifləri küfrdə ittiham edirlər. Onların fikrincə «hər şey Allahdır» demək küfrdür. Əslində onların dediyi mə’nanı anlamaq bizim qüvvəmiz daxilində deyil. Daha dəqiq desək, onların bu fikri sözlə çətin ifadə olunur.

Belə bir hal peyğəmbər və övliyaların məqamına münasibətdə də müşahidə olunur. Həzrət Peyğəmbər (s) buyurmuşdur: «Əgər İsa haqqında deyilənlərin qardaşım Əli (ə) haqqında deyiləcəyindən qorxmasaydım onun məqamını olduğu kimi bəyan edərdim»(2). Həzrət Peyğəmbər (s) Əlinin (ə) uca məqamının insanları çaşdıra biləcəyindən ehtiyatlanır. Bir zaman İsanın (ə) uca məqamından yanlış nəticəyə gələrək onu Allah



---

۱- [۹] «Biharul-ənvar», cild ۷۸.

۲- [۱۰] «Biharul-ənvar», cild ۲.

adlandıranlar xatırlanır. Peyğəmbərin (s) belə bir bəyanatdan çəkinməsinə baxmayaraq yenə də Əlini (ə) «Allah» adlandıranlar tapıldı. Hansı ki, Əlinin (ə) yüksək .məqamından ən yaxın səhabələr belə xəbərsiz idi

Bu gün də böyük şəxsiyyətlər haqqında fərqli rə'ylər mövcuddur. Bunun səbəbi insanların dərketmə səviyyəsinin müxtəlifliyidir. Bu adamlar Allah eləməmiş, Əhli-beyt düşməni deyildirlər. Sadəcə, dərketmə səviyyələri fərqlidir. Şəksiz ki, hamı övliyaları .tanımaq mərtəbəsində ola bilməz

## DƏRK EDİLƏ BİLİNMƏYƏN SİRLƏR

Danışarkən dinləyicinin tutumu nəzərə alınmalıdır. Dinləyicinin dərk edə bilməyəcəyi bütün mətləblər «sirr» hesab olunur. Hər adamın yanında izharı mümkün olmayan tövhid, nübüvvət, vilayət maarifi də sirdir. Əgər bunu nəzərə almasaq insanlar yolunu .azar, cəmiyyətdə ixtilaflar yaranar. Hər hansı ictimai-siyasi məsələ də sirr ola bilər

İmam Hüseyndən (ə) sonra imamlar ömürlərinin böyük hissəsini təqiyyədə (əqidəni gizləmək halında) keçirdilər. Çünki mövcud hakimiyyət onların həqiqətini dərk etmək qüvvəsində deyildi. Həqiqət açıqlayan hər bir kəsi şəhadət gözləyirdi. Ona görə də mə'sum imamlar əvvəlcə hal əhlini tapır, sonra onun tutumunu yoxlayır, daha sonra onu tədricən həqiqətin qəbuluna hazırlayırdılar. Deməli, ədalətsiz hakimiyyət qarşısında sirr saxlamaq vacib göstərişlərdəndir. İmam Sadiq (ə) Əbdullah ibn Cündəbə buyuruğunda təbliğatda doğru yol gedənləri bəyənir, bu işdə Əhli-beyt sirrini .açanlara xəbərdarlıq edir

İmam Sadiqin (ə) dövründə məhdud sayda insan onun imamətini qəbul etmişdi. Əksəriyyət isə bu məqamdan xəbərsiz idi. Hətta imam övladları arasında imamət .məsələsindən xəbərsiz olanlar vardı

Bir rəvayətdə nəql olunur ki, İmam övladı olan həzrət Zeyd imam Baqirdən (ə) soruşur: «Sizdən sonra imam kim olacaq?». Rəvayətdən aydın olur ki, imamət məsələsi Əhli-.beytə ən yaxın adamlar üçün belə sual doğurmuşdur

İmam Sadiq (ə) buyurur: «Uzağı və yaxını göstərmək üçün çırağ və rəhbər olanlara Allah rəhmət etsin». Hədisdə «çırağ» ərəbcə «sirac»dan, «rəhbər» isə ərəbcə «mənar»dan tərcümə olunmuşdur. Sirac böyüklü-kiçikli bütün çırağlara aiddir. Amma mənarla yanaşı olduqda kiçik çıraq mə'nasını verir. Mənar isə hündür bir yerdə asılmış və yolçulara yol göstərən çox işıqlı bir çıraqdır. Minarə ona görə həm də mənar adlanır ki, qədimdə ən hündür nöqtəsində uzaqdan görünən çıraq bərkidilmiş yüksəkliyə minarə deyilərmiş. İnsanlar qaranlıqda bu minarələr vasitəsi ilə yolu taparmışlar. İmam (ə) öz buyuruğunda həm yaxında, həm də uzaqda olanlara doğru yol göstərənləri nəzərdə .tutur

## ƏMƏL SÖZÜN TƏ'SİRİ ÜÇÜN ŞƏRTDİR

Doğru məzhəb təbliğində təbliğatçının sözü əməli ilə uyğun gəlməlidir. Əgər nur tədricən mülayim şəkildə başqalarına tə'sir edirsə, od yandırıb-yaxır. Təbliğat zamanı od yox, nur kimi olmaq lazımdır. Tünd danışmaqla dinləyiciyə əziyyət vermək olmaz. Mülayim rəftar insana tə'sir üçün mühüm amildir. İmam Sadiq (ə) hədisin davamında (buyurur: «Onlar (Əhli-beyt dostları

.«öz əməlləri və var qüvvələri ilə xalqı bizə tərəf də’vət edirlər

Qeyd edildiyi kimi, bə’zən insanın rəftarı başqalarının ona meyl etməsinə səbəb olur. Hətta bu rəftar diqqəti insanın danışığındakı zəif cəhətlərdən də yayındırır. Nəsihət .zamanı əməlin tə’siri danışıqdan heç də az deyil

Bizim vəzifəmiz İslam göstərişlərinə fərdi surətdə əməl etmək deyil. İnsan üçün ən böyük vəzifələrdən biri başqalarını doğru yola çağırmaqdır. İstər ruhani olsun, istər .qeyri-ruhani, hər kəs öz qüvvəsi daxilində bu vəzifəyə əməl etməlidir

,Kor quyuya düşən zaman görən göz

.Günahkardır, susub deməzsə bir söz

Yolunu azan insanın əlindən tutub doğru yola çəkmək hər birimiz üçün Allahın vacib etdiyi vəzifədir. Bu iş o zaman müyəssər olur ki, nəsihət edənin rəftar və əməli dediyi sözlərə uyğun olsun. Hətta əgər insan ağzını açıb bir kəlmə söz demədən gözəl rəftar nümayiş etdirsə, onun bu hərəkəti ətrafındakılara çox tə’sir edər. Bəli, insan ailəsi, .övladı, dostları və yaxınları üçün nümunə ola bilər

İmam Sadiq (ə) öz buyuruğunda sözü tə’sirsiz qalan təbliğatçıları dolayı yolla qınayaraq onların təbliğat zamanı Əhli-beyt sirlərini açmalarını nöqsan tutur. Belələri doğru üsulla təbliğ əvəzinə Əhli-beyt sirlərini açaraq insanları azdırırlar. Hər bir .müsəlman öz rəftarı və sözü ilə başqalarına tə’sirli olmağa çalışmalıdır

Bu hissədə həqiqi iman və onun xüsusiyyətlərindən danışılacaq. Bu xüsusiyyətlərə əsasən, həqiqi mö'mini tanımaq olar. Həqiqi iman və onun xüsusiyyətləri, həqiqi mö'minin tanıtdırılması, iman dərəcələri haqqında ayə və rəvayətlər çoxdur. Dayaz düşüncəli bə'zi insanlar elə güman edirlər ki, insan üçün yalnız iki hal mövcuddur: mö'minlik və ya kafirlik. Onların nəzərincə Allahı və qiyaməti inkar etməyən insan mö'mindir və mö'minlər arasında heç bir fərq yoxdur. Əslində isə belə deyil. Amma .belə düşüncə tərzi İslamla paralel tarixə malikdir

Bə'zilərinin dini zahiri İslamdan başqa bir şey deyil. Belələri üçün İslam yalnız dünya həyatını qurmaq üçündür. Belələrinin axirət ne'mətlərindən faydalanması qeyri-mümkündür. Bu insanlar əbədi olaraq cəhənnəmin ən aşağı mərtəbəsinə sakin olarlar. Onlar İslamı yalnız zahirdə qəbul etmiş münafiqlərdir. Bu insanları öldürmək, var-dövlətini əlindən almaq olmaz. Onlar müsəlmanla izdivac edə bilər, müsəlman ata-.anadan irs apararlar. Amma bütün bunlar dünya həyatına aid olan zahiri məsələlərdir

İslamın başlanğıc dövründə zahirən müsəlman olmuş bir qrup şəxs məscidə gələr, hətta birinci cərgədə dayanıb namaz qılardılar. Amma bu xüsusiyyətlər həqiqi müsəlman olmaq üçün kifayət deyildir. Qəlbinin dərinliyində Allaha və Peyğəmbərə (s) e'tiqadı olmadığı halda zahirən müsəlman olanlar haqqında dinin zahiri hökmləri icra olunur. Belə müsəlmanlığın ölçüsü

şəhadəteyn-şəhadət kəlmələrini deməkdir. Kəlmeyi-şəhadət deyən şəxs müsəlman olur. Allahın birliyi və həzrət Məhəmmədin (s) peyğəmbərliyinə şəhadət verən insan Allahın hər hansı bir hökmünü qəbul etmədikdə ziddiyyət yaranır. Necə ola bilər ki, insan peyğəmbəri qəbul etsin, amma peyğəmbərin gətirdiyi şəriətə müxalif olsun?! Dinin zəruri hökmlərini inkar etmək küfrdür və belə bir küfr «zahiri küfr» sinfindəndir. Münafiqlərsə belə deyil. Onlar qəlbən zəruri hökmlərə müxalif olduqları halda, zahirdə bütün zərurətləri qəbul etdiklərini iddia edir, əsl düşüncələrini gizli saxlayırlar. Onlar anlayırlar ki, İslamı açıq-aşkar inkar etsələr dünyəvi çətinliklərlə qarşılaşa bilərlər. Bə'zi fəqihlər zəruri hökmün inkarını peyğəmbərin inkarına bərabər hesab edirlər. Bunu hamı bilir ki, Peyğəmbərin (s) bütün göstərişləri Allahın buyuruqlarına əsaslanır. Məsələn, namaz haqqında Peyğəmbərin (s) verdiyi göstəriş Allahın əmrinə əsaslanır .və namazı inkar etmək dini inkar etmək hesab olunur

Demək, insan kəlmeyi-şəhadət söyləməklə zahirən müsəlman olur. Nə qədər ki «səhv etdim müsəlman oldum» deyilməyib, nə qədər ki dinin zəruri bir hökmü inkar .olunmayıb zahiri müsəlmanlıq yerindədir

Zahiri müsəlmanlığın axirət dünyası, behişt və cəhənnəmlə heç bir əlaqəsi yoxdur. Zahiri müsəlman olduğu kimi, zahiri kafir də vardır. Kəlmeyi-şəhadət deməmək, dinin .zəruri hökmünü inkar etmək zahiri küfrdür

Şərti olaraq zahiri müsəlmanlığı «islam», həqiqi müsəlmanlığı isə «iman» adlandıraq. :Allah-təala Qurani-Kərimdə buyurur: «Biz iman gətirdik» dedilər. De ki

Siz iman gətirmədiniz. «İslamı qəbul etdik» deyin!»(۱) İslam dini dildə qəbul edib, ona» .zahirən əməl etməkdirsə, iman qəlbə aid olan bir məsələdir

Bə'zən belə ola bilər ki, həqiqi bir müsəlman ömrünün sonunadək təqiyyə edərək imanını gizləyə. Misal olaraq Fir'onun mö'min ailəsini və ya həzrət Əbu Talibi göstərmək olar. Rəvayətlərdə bildirilir ki, Əbu Talib İslamın başlanğıc dövründə iman gətirənlərdən idi. Hansı ki, bə'zi məzhəb nümayəndələri Əbu Talibin əqidəsini gizlətməklə Peyğəmbəri (s) müdafiə etdiyini nəzərdən qaçıraraq, onun müsəlman .olmadığını iddia edirlər

Bu mövzuya Qur'ani-Kərimdə də toxunulur: «Fir'on ailəsindən olub imanını gizli saxlayan bir kişi»(۲), «Qəlbi imanla sabit olduğu halda, küfrə məcbur edilən şəxs istisnadır»(۳). Əgər bir şəxs dini dəyərləri və övliyaları canını qorumaq üçün inkar etməyə məcbur olarsa bu iş onun imanı üçün təhlükəli deyil. Həmin şəraitdə imanı gizlətməklə təqiyyə vacibdir. Həzrət Əbu Talibin bütün ömrünü təqiyyədə keçirməsi yuxarıda deyilənləri təsdiqləyən gözəl bir misaldır. Bəli, iman insanın daxili aləminə aid .olan bir həqiqətdir

Qədim zamanlarda gün uzunu imansız ağanın nəzarəti altında olan qullar qəlblərində ibadət edərdilər. Yə'ni iki rək'ət namaz qılmağa qüvvəsi çatmayan insan qəlbində .ibadət edə bilər



---

.Hücərat» surəsi, ayə ۱۴»[۱۱]-۱

.Ğafir» surəsi, ayə ۲۸» [۱۲]-۲

.Nəhl» surəsi, ayə ۱۰۶» [۱۳]-۳

Maraqlıdır ki, iman necə əldə olunur? Bə’ziləri belə hesab edirlər ki, iman yalnız inanmaqdan ibarətdir. Guya Allaha inanan insan bütün günahlara batsa belə, behiştə gedəsidir. Bu fikirdə olanlar Mürciə adı ilə məşhurdur. Xəvaric adlanan digər bir qrup isə bu fikirdədir ki, böyük günaha yol verən mö’min kafir olur. Əli (ə) məşdur həkəmiyyət məsələsini qəbul etdiyi üçün xəvaric o Həzrəti (ə) və onun tərəfdarlarının .qətli barədə hökm çıxarmışdılar

Amma Əhli-beyt imamlarının nəzərincə bu baxışların heç biri düzgün deyil. Yə’ni insan nə təkcə qəlbindəki imanla behiştə gedə bilər, nə də bir böyük günaha yol verməklə imandan xaric olar. Bəli, ömrünün son nəfəsinədək imanını qorumuş şəxs qiyamət səhnəsində günahlarının cəzasını aldıqdan sonra şəfaətə nail olarsa behiştə gedə .bilər

İnsan son nəfəsədək imanını qoruya bilsə nicatverici qüvvəyə malik olan iman onu xilas edə bilər. Amma unutmaq olmaz ki, insan hər dəfə günah etdikdə onun imanı zəifləyir və dünyadan imanlı getmək ehtimalı azalır: «Allahın ayələrini yalan hesab edib onları məsxərəyə qoymaqla pislik edənlərin aqibəti lap pis oldu»(۱). Əhli-beytin nəzərincə, Allah-təala böyük günaha yol vermiş mö’minə tövbə üçün möhlət verir. Tövbə etməyən mö’min bərzəx dünyasında günahı qədər cəzalandırılır, imanını .qoruya bilmişsə, qiyamətdə nicat tapır



---

.Rum» surəsi, ayə ۱۰» [۱۴]-۱

Deyilənlərdən aydın oldu ki, şərti olaraq İslam adlandırdığımız zahiri iman şərti olaraq iman adlandırdığımız həqiqi imandan tamamilə fərqli bir məfhumdur. Zahiri İslamın axirət səadətinə heç bir tə'siri yoxdur. Bununla belə, zahirdə də müsəlman dini əsasları və zərurətləri təsdiq etməlidir. Axirəti, namazı inkar edən şəxs heç zahiri müsəlman sayıla bilməz. Təkcə kəlmeyi-şəhadət deməklə müsəlman olmaq yanlış təsəvvürdür. İslamın başlanğıcındakı adi müsəlmanlar axirət inamının zəruri olduğunu !?bilirdilərsə, bu günkü müsəlmanlar belə mühüm bir inancdan xəbərsiz ola bilərlərmi

Əgər zahiri müsəlmanlıq batini kafirliklə birləşərsə əbədi əzab qaçılmazdır. Zahirdə İslamın bütün əsasları və zərurətlərini təsdiq edib, batində bütün bunlara düşmən kəsilənlər az deyildir. Deməli, cəmiyyətdə saleh bir müsəlman kimi tanınmış şəxsin qəlbində damlaca iman olmaya da bilər. Əlbəttə ki, kimin müsəlman, kimin qeyri-.müsəlman olmasını müəyyənləşdirmək fəqihlərin işidir

İslamın elə mərtəbələri də vardır ki, hətta peyğəmbərlər bu mərtəbələrə çatmaq üçün Allaha dua etmişlər. Həzrət İbrahim və həzrət İsmail Kə'bəni tikərkən belə dua etmişdilər: «Ey Rəbbimiz, bizim hər ikimizi müsəlman qərar ver»(١). Ayədə İslamın ali .mərtəbəsi dedikdə, mütləq təslimolma nəzərdə tutulur

Eləcə də, təkcə imanı nicatverici hesab edən mürciə baxışı da həqiqətdən uzaqdır. Bir insan dünyadan imanlı getsə də yol verdiyi günahlara görə müxtəlif əzab



---

.Bəqərə» surəsi, ayə ١٢٨» [١۵] -١

mərhələlərini keçəcəkdir. Rəvayətlərdə buyurulur ki, mö'min öz günahlarına tövbə etmədən dünyasını dəyişərsə ölüm mələyi olun canını əziyyətlə alar. Əgər bu əziyyətlə günahlar paklanarsa insan bərzəx dünyasında sakit olar. Amma canvermə əziyyəti günahları yumağa kifayət etməsə birinci qəbir gecəsi ağır keçər. Əgər bu əzab da kifayət olmasa günahlar yuyulanadək bərzəx aləmində əziyyət davam edər. Mümkündür ki, bərzəx aləminin əziyyətləri də günahların paklanması üçün kifayət etməsin. Belə olduğu təqdirdə günahkar insanı qiyamət səhnəsinin məşəqqətləri gözləyir. Amma bu mərhələlərin istənilən birində ləyaqətli insan şəfaətə nail ola bilər. .Başqa sözlə, Əhli-beyt (ə) vasitəsi ilə bağışlana bilər

Rəvayətdə buyurulur ki, mə'sum imamlar bərzəx aləmində yox, qiyamət səhnəsində öz işlərinə zəmanət verəcəklər. Demək, mö'min kişi bərzəx aləmində uzun illər əzab çəkə bilər. Allaha pənah aparaq! Şəfaətə nail olmaq o demək deyil ki, insan dünyasını dəyişən kimi bağışlanacaqdır. Şəfaətin də mərhələləri vardır və ən tə'sirli şəfaət qiyamət gününə məxsusdur; qiyamət gününə qədər günahları təmizlənməyən insan cəhənnəmə gedəcəkdir. Elə bu səbəbdən də Əhli-beyt buyuruqları gəncləri «mürciə» düşüncə tərzindən uzaq olmağa çağırır. Bu düşüncə tərzi insanları yuxuya verərək onları günah bataqlığına çəkir. İslam dininə belə yanaşma olduqca təhlükəlidir. Ümumiyyətlə, cəzasızlıq insanı cinayətə sövq edir. Onu da qeyd edək ki, təkcə iman .gətirmək kifayət olsaydı bu qədər dini göstərişə ehtiyac qalmazdı

Bu da həqiqətdir ki, bütün insanlar eyni iman səviyyəsinə malik ola bilməzlər. İmanın bir çox mərtəbələri vardır. Əslində bu mərtəbələr sonsuzdur. İki insan eyni bir .mərtəbəli imana malik ola bilməzsə, demək bu mərtəbələr çoxdur

Ən mühüm vəzifə budur ki, insan zahiri müsəlmanlıqla kifayətlənməyib həqiqi iman üçün çalışsın. Atadan irs aparmaq, müsəlmanlıq səbəbindən pak olmaq və bir çox başqa xüsusiyyətlər bu dünyanın zahiri hökmləridir. Axirət səadəti üçünsə qəlb imanı .zəruridir

İnsan çatdığı iman mərtəbəsi ilə kifayətlənməməli, kamil insan olmaq üçün çalışmalıdır. İman bəʼzən güclənib bəʼzən də zəifləyə bilər. Güclü iman özünü əməldə .büruzə verir

## HƏQİQİ İMAN VƏ HƏQİQİ MÖʼMİNİN XÜSUSİYYƏTLƏRİ

Bəʼzi Qurʼan ayələri həqiqi imanı tanıtdırır və insanları belə bir imana yiyələnərək onu kamilləşdirməyə çağırır. Bu ayələrdən biri «Ənfal» surəsinin ٢-ci ayəsidir: «Möʼminlər yalnız o kəslərdir ki, Allah adı çəkiləndə ürəkləri qorxudan titrəyər». Özümüzü sınaqdan keçirməklə belə bir xüsusiyyətə malik olub-olmadığımızı müəyyənləşdirə bilərik. Bu .ayə haqqında ətraflı danışsaq daha yaxşı olar

Qurʼan dilində «qəlb» həm məʼrifət, həm də hiss və xasiyyətlər mərkəzidir. Yəqinlik, iman, məhəbbət, qəzəb, qorxu, ümid və sair xüsusiyyətlərin və hisslərin yeri qəlbdir. Elmi dildə desək qəlb hisslərin maarif ocağıdır. Əgər qəlbdə iman varsa imana uyğun hiss önə

gəlməlidir. Əgər insan bir şəxsi həqiqətən sevərsə o şəxs yada düşər və ya başqa biri onun adını çəkərsə insanın halı dəyişər. Məhəbbət çox olduqca, hal da çox .dəyişməlidir

Halın dəyişməsi Allahın yada salınmasından asılıdır. Allahı sonsuz əzəmət sahibi kimi tanıyan insanın tanıma dərəcəsindən asılı olaraq halı dəyişir. Bu işdə Allah qorxusu deyilən hiss olduqca tə’sirlidir. «Sən yalnız Rəbbindən qorxanları xəbərdar edirsən»(١). Bəli, belə bir qorxu olmadığı halda də’vət və nəsihətlər faydasız qalır. Ayələrdə «vəc’əl» kimi ifadə olunmuş hal həmin təkan, silkələnmə halıdır. İnsan belə bir hal keçirməsə Allahı xatırlamaq əhəmiyyətsizdir. Allahı düşünən zaman insanın halı dəyişmirsə bu həqiqi iman deyil. Demək, imanın ilk xüsusiyyəti budur ki, Allah yada düşən an hal .dəyişsin

Həqiqi imanın ikinci xüsusiyyəti odur ki, dəyişməz və durğun olmasın» buyurulur. İman» daimi hərəkətdə olmalı, inkişaf etməlidir. Qur’an ayəsi eşidən insanın imanı artmalıdır. İmanın müəyyən bir mərtəbəsinə malik olan insan üçün Qur’an Allahın göndərdiyi bələdçidir. Sevdiyi şəxsdən məktub alan insan şövqə gəlib sevinir. Qur’an isə Allahın öz bəndələrinə məktubudur. Necə ola bilər ki, insanın iman gətirdiyi Allahın məktubu oxunarkən insanın halı dəyişməsin?! Hal dəyişmirsə, demək iman zəifdir. Qur’ani-Kərimdə buyurulur ki, qəlbindəki imanı diri olan insan Qur’an oxunarkən diqqətlə .qulaq asır və nəticədə imanı artır

İmanın üçüncü xüsusiyyəti «yalnız Allaha təvəkkül edilməsidir». Elə ki, insanın imanı artır bütün



---

.Fatir» surəsi, ayə ١٨» [١۶] -١

müşküllərinin açılışını Allahdan bilir, Onun hər şeyi əhatə etdiyini anlayır, nəticədə Allahdan başqasına e’timad göstərmir. İnsan adətən, təzahürlər silsiləsini görür, amma əsl amildən xəbərsiz qalır. Hansı ki, insanın bütün gördükləri yalnız Allahın !?iradəsi ilə hərəkətə gəlir. Bunu anlayan insan Allahdan qeyrisinə bağlana bilərmi

Digər bir tərəfdən ata-ana qarşısında, övliyaların hüzurunda təvazö göstərərək kiçilmək tapşırılır. Sözsüz ki, burada əsas məqsəd Allahın əmrinə itaətdir. Mö’minin .şəxsiyyəti Allahdan qeyrisinə əyilməyə imkan vermir

Yuxarıda mö’minin üç xüsusiyyətindən danışıldı. İman üçün iki zahiri əlamət də vardır: namaz və infaq (ehtiyaclıya kömək). «Ənfal» surəsinin ٣-cü ayəsində buyurulur: .«(Mö’minlər) Namaz qılar və verdiyimiz ruzidən Allah yolunda sərf edərlər

Sadalanan üç batini və iki zahiri xüsusiyyət həqiqi imanın əlamətləridir. Allah-təala bu xüsusiyyətləri sadaladıqdan sonra «məhz onlar həqiqi mö’minlərdir»-deyə buyurur. İnsanın düşüncəsində və əməlində əsər qoymayan iman iman deyil. İmam Sadiq (ə) da İbn Cündəbə bu həqiqəti belə çatdırır: «O şəxslər mö’mindirlər ki, qəlblərində Allah qorxusu olsun». İnsan adətən, bu incə nöqtəyə diqqət göstərmir. Biz adətən, Allahdan pis işimizə görə qorxuruq. Çünki pis iş insanın süqutuna səbəb olur. Hansı ki, insan pis .iş görməsə də qorxmalıdır

İnsan hər an Allahın yardımına ehtiyaclıdır. Məsələn, biz yalnız onun köməyi ilə imanımızı qoruya bilərik. Həzrət Mə’sumənin (ə) ziyarətində oxuyuruq: «Malik olduğumu məndən alma». «Ali-imran» surəsinin ٨-ci ayəsində buyurulur: «Ey Rəbbimiz, bizi doğru yola

yönəltdikdən sonra qəlbimizə şübhə salma». İnsan necə əmin ola bilər ki, malik olduğu .imanı əldən verməyəcək? Bütün bunları nəzərə alan insan Allah dərgahına əl açır

Deməkd, mö’min insan Allahın əzəmətindən qorxur. Bu qorxu günaha görə qorxudan fərqlənir. İmam Sadiq (ə) buyurur: «Mö’min ona nəsib olmuş doğru yolu (hidayəti) itirməkdən qorxur». Gündəlik namazda insan məhz bu qorxu ilə «bizi doğru yola hidayət et» kəlmələrini bir neçə dəfə təkrarlayır. Allahın hidayətindən məhrum olan insan yolunu azır. Ona görə də mö’minin Allahdan iki qorxusu vardır: Allahın əzəmətini .düşünərkən duyulan qorxu və Allahın ne’mətlərindən məhrum olmaq qorxusu

İlahi ayələri dinləyən mö’minin imanı artır. Eləcə də, yaranışdakı ilahi dəlillər müşahidə .ediləcək ilahi qüdrətin bütün dünyaya nüfuz etdiyi aşkarlanır

İmam Sadiq (ə) buyurur: «Cəhl və nadanlığın bünövrəsi qədim dövrdən möhkəmlənmiş, bazarı rövnəq tapmış, dərin kök atmışdır». Cəhalət bazarının rövnəqlənməsinin səbəblərindən biri dinin oyuna çevrilməsidir. Hətta öz elmini Allaha yaxınlaşmaq üçün vasitə edənlərin də niyyəti ilahi olmamışdır. Həzrət (ə) bu insanları «ədalətsiz» adlandırır.

Deyilənlərin aydınlaşması üçün bə'zi nöqtələrə diqqət etməliyik. İmam (ə) «qədimdən cəhalətin bünövrəsi möhkəmlənmiş» buyurarkən nəyi nəzərdə tutur? Əgər cəhalət təbii hadisələrin məfhumunu bilməməkdirsə bunun dinlə nə əlaqəsi var? Hər bir millət ətraf aləmi öyrənmək üçün zəhmət çəkmiş, elm oxumuş, təcrübələr aparmış və bununla da öz cəhalətini müəyyən həddə aradan qaldırmışdır.

Göründüyü kimi imam Sadiq (ə) dünyəvi elmlər sahəsindəki nadanlığı yox, insan xoşbəxtliyinin yeganə tə'minatçısı olan dini elmlərə münasibətdəki cəhaləti nəzərdə tutmuşdur. Bu elmlər peyğəmbərlərin gətirdiyi Allahıtanıma, insanın taleyi, axirət dünyası, düzgün yaşayış tərzi mövzularını əhatə edən biliklərdən ibarətdir. Bəşəriyyət üçün zəruri olan bu elmlərdir. Bu elmlərdən xəbərsiz insan dövrünün filosofu olsa belə, yenə də cahil hesab olunur. Qur'an baxımından əsl cəhalət budur!

İnsanların cəhalət girdabına yuvarlanmasının, Allahın peyğəmbərlər vasitəsi ilə göndərdiyi elmlərdən lazımi dərəcədə istifadə olunmamasının müxtəlif səbəbləri vardır. Əsas səbəbkarlardan biri zalım sərmayədarlardır. Çünki cəmiyyət savadlı olduqda istismarçılar üçün çətinlik yaranır. Dini göstərişlərə əməl edən insan ictimai ədalətsizliyə qarşı səsini qaldırır. Bu səbəbdən də böyük sərmayə sahibləri cəmiyyətin .dini agahlığına qarşı amansız mübarizə aparırlar

Dini cəhalətin digər bir səbəbi din adamlarının biganəliyidir. Bir çox dindarlar dinə əyləncə, çörək yeri kimi baxırlar. Özü dinə ciddi yanaşmayan təbliğatçının sözü tə'sirli ola bilərmi? İnsanlar dinə münasibəti din adamlarından öyrənirlər və din adamının .dinə yüngül münasibəti xalqın dini biliklərindən məhrumiyyəti ilə nəticələnir

Tarixdən və dini mətnlərdən belə mə'lum olur ki, cəmiyyətin azğınlığının əsas səbəbi nadanlıq, cəhalətdir. İnsan fitrətən allahpərəst olduğundan özündən asılı olmayaraq dinə maraq göstərir. Tarixdə tamamilə dinsiz insanlara demək olar ki, təsadüf olunmur. İnsan fitrətindəki allahpərəstlik istəyinə cavab olaraq bütə, aya, günə, oda, .bir sözlə, öz təsəvvürünə uyğun tanrıya pərəstiş edir

Qədim dünya tarixində aparılmış araşdırmalarda müxtəlif dinlər və e'tiqadlarla rastlaşırıq. Bu fakt bir daha insanların allahpərəst fitrətə malik olduğunu təsdiq edir. Amma fitri suallarına doğru cavab tapmayanlar təbii olaraq yanlış inanclar ardınca gedir. Onlar mələkləri

Allahın qızları bilir, bütlərdən şəfaət umurlar. Doğru yola də'vət olunduqda isə deyirlər: «Biz bütlərə yalnız bizi Allaha yaxınlaşdırmaq üçün ibadət edirik»(1).

Hələ məsihilikdən qabaq ikiallahlı müşriklər olmuşdur. Həzrət İsanı (ə) «Allahın oğlu» adlandıran məsihilər üçallahlıq ideyasını həmin müşriklərdən əxz etmişlər. Bu yanlış düşüncələrin səbəbi cəhalətdir. Bu sayaq xurafatlara sonradan yaranmış bütün məzhəblərdə istisnasız olaraq təsadüf olunur. Cəmiyyətin cəhalətindən şəxsi məqsədləri üçün istifadə edənlər də az olmayıb. Məsələn, insanlardan pul alaraq onların günahlarını bağışlatdıracaqlarını və'd ediblər. İndi də belə hallarla rastlaşırıq.

Peyğəmbərlər cəhaləti aradan qaldırmaq, özlərindən əvvəlki kitabın mə'ruz qaldığı təhrifləri islah etmək, cəmiyyəti vahid məqsədə yönəltmək üçün gəlmişlər. «Biz hər ümmətə Allaha ibadət edib, tağutdan çəkinsinlər deyə, peyğəmbər göndərmişik»(2). Amma peyğəmbərlərin buyuruqlarına da min bir rəng verməklə cəhalətə sürüklənənlər az deyil. Əksər cəmiyyətlərdə insanları ardıcıl şəkildə doğru yola çağıranların olmasına baxmayaraq digər bir qrup daim cəhaləti dəstəkləmiş və onun aradan qaldırılmasına mane olmuşdur.

Qeyd edildiyi kimi, cəmiyyətdə cəhalətin rəvac tapmasının digər bir səbəbi dindarların rəftarıdır. Dindarların dinə ciddi yanaşmadığını görən insanlar cəhalətə düçar olur.

Latın Amerikasından olan bir keşiş deyir: «Bizim cəmiyyətdə insanlar keşişlərə inanmır. Nəinki onlar, hətta



---

1- [17] «Zumər» surəsi, ayə 3.
2- [18] «Nəhl» surəsi, ayə 36.

keşişlər özləri də öz dediklərinə əmin deyillər». Onlar elə düşünürlər ki, din yaşamaq üçün bir vasitədir. Ona görə də dediklərinə inansalar belə, ona ciddi yanaşmırlar. Onların nəzərincə din keçmiş nəsillərdən miras qalmış adət-ən’ənədir. Beləcə, din oyuncağa çevrilir və din təbliğatçıları dini bərbəzəkli süfrə xatirinə təbliğ edirlər. Onlar camaatın razılığını qazanmaq üçün dini onların xoşlayacağı bir şəkildə təfsir edirlər. Bə’zən də öz işlərinə bəraət qazandıraraq iddia edirlər ki, belə etməsək insanlar dindən uzaqlaşar. Məsələn, ilkin məsihilikdən haram buyurulmuş bir çox şey kilsə tərəfindən halal edilmişdir. Kilsə öz cinayətini belə izah edir ki, yalnız bu yolla insanları dində saxlamaq mümkündür. Hətta son dövrlər Avropada oruc tutmayan məsihilərə heç olmasa bir gün «televiziya orucu» tutmaq təklif olunur. Allahın əmri olan oruc ayini bir gün televiziyaya baxmamaqla əvəz olunmağa çalışılır. Əlbəttə ki, cəmiyyətdə bu .sözlər qulaqardına vurulur

Beləcə, məsihilikdə dini hökmlər bir-birinin ardınca ləğv olunur. Qur’ani-Kərimdə dini oyuncağa çevirənlər haqqında kifayət qədər danışılıb. Şənbə günləri balıq ovu haram edilmiş bir Bəni-İsrail tayfası həmin qazancı əldən verməmək üçün dənizin kənarında hovuzlar düzəltmişdi. Şənbə günləri bu hovuzların dənizə olan yolunu açardılar ki, balıqlar hovuza dolsun. Növbəti gün gəlib həmin balıqları tutardılar. Allah-təala bu tayfanı oyunbazlığına görə cəzalandırardı. «Ə’raf» surəsinin ۱۱۶-cı ayəsində buyurulur: «Qadağan olunmuş işə saymazyana münasibət bəslədikləri vaxt onlara əmr olundu: .««Zəlil meymunlara dönün

Maraqlıdır ki, dini məsələlərə qeyri-ciddi yanaşma dindarlarda da müşahidə edilir. Onlar elə güman edirlər ki, dini göstəriş adət-ən'ənə kimi dəyişə bilər. Məsələn, insan öz həmsöhbətinə «qurbanın olum» deyir, hansı ki, tükünü də verməyə hazır deyil. .Uyğun münasibəti dinə göstərmək əbədi əzabla nəticələnir

Əgər insanlar görsələr ki, dinə doğrudan da ciddi yanaşılır və bunun cəmiyyətdə müsbət nəticələri var, onlar da dinə maraq göstərərlər. İmam Sadiq (ə) öz vəsiyyətində şiələrin diqqətini bu məsələyə yönəldir. Özünü Əhli-beyt tərəfdarı və .aşiqi bilən hər bir müsəlman dinə ciddi yanaşmalıdır

## DİN QARŞISINDA VƏZİFƏLƏRİMİZ

İmam Sadiq (ə) yuxarıdakı buyuruğu bu gün bizə ünvanlamışdır. Dinə ciddi yanaşmalı, dini e'tiqadlarımız, əxlaqımız və əməllərimizə biganə yanaşmamalıyıq. Unutmaq olmaz .ki, dini hökmlərin hər hansı yanlış izahatı başqalarını da doğru yoldan azdırır

Yəzd alimlərindən biri çox ağlayırmış. Səbəbini soruşduqda, belə cavab verdi: «Qorxuram qiyamətdə deyələr ki, sən öz vəzifələrinə düzgün əməl etsəydin Yəzd .kafirləri müsəlman olardı!». Əməllərinə diqqətli olan insanlar bu sayaq narahatdır

İmam Sadiq (ə) xalqın cəhalətdə olmasına bə'zi dindarların əməllərini səbəb göstərir: «Ey Cündəb oğlu, qədim dövrdən cəhalətin bünövrəsi möhkəm olub, çünki dini .«oyuncağa çeviriblər

İnsanın bütün rəftarları iki hissədən ibarətdir: insanın zəruri bildiyi ciddi işlər və .əyləncə xarakterli qeyri-ciddi işlər

Allahın dinini oyuncaq hesab edənlər üçün dini vəzifələr adət-ən’ənə kimi qeyri-ciddi görünür. Onlar bu vəzifələri xalqı razı salacaq formada təfsir etməklə özlərinə müştəri .yığırlar. Allahın dini qeyri-ilahi məqsədlər üçün istifadə edilir

İmam Sadiq (ə) buyurur: «Ey Cündəb oğlu, əgər bizim şiələrimiz möhkəm olsalar mələklər onlarla görüşər, buludlar onlara kölgə salar, başları üstündən və ayaqları altından onlara ruzi göndərilər, bütün istədikləri onlara əta olunar».

Bütün insanlar səadət sorağındadırlar. Onlar çətinlikdən sıxılır, xilas olmaq üçün yol axtarırlar. Amma hər zaman səadətə can atan insan həqiqi xoşbəxtliyi tanımaqda çətinlik çəkir.

Çoxları belə təsəvvür edir ki, onların fitri istəyi olan xoşbəxtlik ötəri dünya ləzzətlərindədir. Ona görə də həqiqi səadəti tanımamış öz təsəvvürlərinin əmri ilə dünya ləzzətləri dalınca qaçırlar.

İkinci bir qism insan isə anlayır ki, ötəri dünya ləzzətləri səadət ola bilməz. Onlar açıq-aşkar görür ki, hər hansı dünya ləzzətini xoşbəxtlik bilən insan bu ləzzətə çatdıqdan bir müddət sonra nəinki özünü xoşbəxt hiss etmir, hətta bədbinliyə qapılır. Bu insanlar səadəti nədə görürlər? Bu sualın cavabında onlar da iki qrupa bölünür:

Birinci qrupa mənsub olanlar öz ağılları və ilahi peyğəmbərlərin köməyi ilə həqiqi səadəti Allaha yaxınlıqda tapırlar. Onlar əmin olurlar ki, əbədi xoşbəxtlik yalnız Allaha yaxınlıqdır. İkinci qrupa mənsub insanlar isə gecə-gündüz baş sındırır, mübahisə edir, şəkk-şübhəyə düşür və ömürlərinin son nəfəsinədək əzab çəkirlər.

Həqiqi səadəti tanımaq istəyənlər və onu Allahla yaxınlıqda görənlər əvvəlcə bu məqama aparan yolu tanımalıdırlar. Amma səadəti Allahla yaxınlıqda görənlərin əksəriyyəti bu səadət yolunu tanımaq üçün lazımınca sə'y göstərmirlər. Onlar cəmiyyətin tə'siri altına düşərək həqiqi təkamül yolundan uzaqlaşırlar. Əlbəttə ki, bu sahədə müvəffəqiyyətlər də fərqlidir. Kimi fərdi, kimi ictimai, kimi də siyasi məsələlərdə zəruri agahlığı əldə edə bilmir. Amma doğru yolu tanımaq da azdır. Bu yolu tanıdıqdan sonra hərəkətə başlamaq lazımdır. Doğru yola düşmüş insanın səadətə çatması onun iradəsindən, ifratla təfrit arasında orta həddi tuta bilməsindən .çox asılıdır

## MÖ'MİN VƏ İLAHİ NE'MƏTLƏR

Araşdırma aparıb doğru hədəfi tanıyan və düzgün əməl edən insan hansısa dünya və axirət ne'mətindən məhrum ola bilərmi? Allah-təala kainatı insanın təkamülə çatması və əbədi səadətə nail olması üçün yaratdığından doğru yol yolçusunun ilahi ne'mətlərindən məhrum edilməsi məntiqsiz olardı. Hətta azğın insanlar bu ne'mətlərdən faydalandığı halda, mö'min şəxs nə üçün məhrum olmalıdır?! Allah-təala mö'min üçün faydalı olan bütün ne'mətləri ona əta edir. «Hədid» surəsinin ۲۱-ci ayəsində buyurulur: «Göylər və yer qədər geniş olan behiştə nail olmaq üçün çalışın!». Bitib-tükənməz behişt ne'mətləri dünya ne'mətlərindən tamamilə fərqlənir. Bu ne'mətlərdən istifadə edən doyub çəkinməz. Orada nə yorğunluq, nə zəiflik, nə də ağrı-acı olar. Doğru yolu tanıyıb onunla son məqsədə çatanlar üçün axirətdə heç bir çətinlik yoxdur. «Zuxruf» surəsinin ۷۱-ci ayəsində buyurulur: «Orada onların ürəkləri istəyən və gözlərini oxşayan hər şey olacaqdır». Əlbəttə ki, bu ne'mətləri

təsəvvür etmək çətindir. Amma dünya ne’mətləri, hətta halal olduqda belə məhdudiyyətlərə məhkumdur. İnsan bu ne’mətlərdən istifadə edərkən həddi gözləməsə fəsadlarla üzləşər. Allah istədiyi bəndələrə dünya ne’mətlərini məhdud verir ki, insan bu ne’mətlərin əsarətinə düşüb axirət səadətinin tə’minatçısı olan imandan məhrum olmasın. Elə bu səbəbdən də bə’zi layiqli bəndələr dünya çətinlikləri .ilə üzləşirlər

Əslində dünya həyatında çətinliklər labüddür. Əgər dünya ne’mətlərinin çoxluğu insanı kamilləşməsi üçün faydalı olsaydı Allah öz layiqli bəndələrini bu ne’mətlərə qərq edərdi. Layiqli bəndələr Allaha təvəkkül edərək adətən belə dua edirlər: «Ey Rəbbimiz, bizə faydalı bildiklərini nəsib et». Beləcə, Allah öz istəkli bəndələrinə yalnız faydalı ne’mətlər əta edir. Əgər bir mö’min üçün dünya çətinlikləri yaranırsa bu işdə məqsəd .onun axirət məqamını yüksəltməkdir

Bəs bu insanlar kimdir? Yaranış məqsədini anlayanlar, yoxsa həqiqi məqsədə doğru ?hərəkət edənlər? Bu insanlar yəhudi, məsihi, yoxsa buddistdirlər

Bizim əqidəmizə görə yeganə doğru yol İslamdır. Axirət səadətini yalnız müsəlman anlaya bilər. İnsanın həqiqi itkisi Allaha yaxınlıqda axtarılmalıdır. Müsəlmanın həqiqi istəyi Allahdır. Allaha çatmaq üçün yeganə yol İslam göstərişlərinə əməl etməkdir. Bir müsəlmanın İslam göstərişlərindən xəbərsiz qalması qeyri-mümkündür. Demək, məqsədi tanıyan az-çox doğru yolu da tanıyır. Dünya və axirət ne’mətlərinə çatmaq .belə bir şəxsin haqqıdır

İslamda da müxtəlif firqələr vardır. Təəssüf ki, doğru yolu tapmaq istəyən insanlar bə’zən buna müvəffəq olmur. Xüsusi ilə mə’sum imamların dövründə zalım hökumətlərin yaratdığı çətinliklər səbəbindən həqiqi İslamı tanımaq çətin olmuşdur. Əgər insan öz mə’lumatsızlığında günahkar deyilsə də bildiyi qədər vəzifəlidir. İnsanların məhrum edildikləri həqiqətlərdə onlar üçün nəzərdə tutulmuş kamilliklər vardır. Başqalarının təqsiri ucbatından əsl həqiqəti tapa bilməmiş insanlar çatdıqları məqama uyğun mükafatlandırılacaqlar: «Biz yaxşı iş görənlərin mükafatını zay etmərik»(١).

Amma həqiqi yolu tanıdıqdan sonra bu yolda tər tökənlər üçün bildiklərinə əməl etdiklərinə görə də mərtəbələr vardır. Əhli-beyt yolunu gedən insanlar arasında da fərqlər mövcuddur. Bə’ziləri bu yolun incəliklərindən xəbərsiz də qala bilər. Yolu kamil tanıyanlar üçün nəticələr də yüksəkdir.

İslam dinində Əhli-beyt yolunu tutanların həqiqəti tanımaqda heç bir problemi yoxdur. Qalır əməl etmək! Bütün bəşəriyyət bu doğru yolu tutarsa Allah hər bir insanı öz ne’mətlərində qərq etmək qüdrətindədir: «Bir şeyi istədiyi zaman Allah yalnız «ol» buyurar»(٢). Dünyaya aid olan məhdudiyyətlər axirətə aid deyildir.

Məqsədi düzlükdə bilib ona çatmaq üçün bütün gücünü səfərbər edənlər Əhli-beyt yolunu düzgün tanımış müsəlmanlardır.



---

١- [١٩] «Kəhf» surəsi, ayə ٣٠.

٢- [٢٠] «Yasin» surəsi, ayə ٨٢.

## DÜZLÜK SƏADƏTİN ŞƏRTİDİR

Mərhum imam (r) öz söhbətlərində təkrar-təkrar bu hədisi xatırladaraq buyurur ki, insanı qocaldıb qəddini əyən həmin bu «istiqamətdir». «Fussilət» surəsinin ۹۰-cı ayəsi istiqamətli insanları müjdələyir: «Şübhəsiz ki, «Rəbbimiz Allahdır» deyən, sonra da düz olan kəslərə mələklər nazil olub belə deyəcəklər: «Qorxmayın və kədərlənməyin, və'd olunmuş cənnətə sevinin».

Allaha iman, həqiqi din və Əhli-beyt məktəbinin qəbulu kifayət deyildir. Bu yolda möhkəmlik göstərib düz olmaq lazımdır. İnsan bir an olsun belə özünü itirib büdrəməməlidir. Belə bir insandan Allah heç nəyi əsirgəməz, beləsinin duaları qəbul olar. Belə insan mələklərlə görüşər, yüksək kamillik məqamına çatarsa mələkləri görə də bilər.

## DÜNYA NE'MƏTİ, MÖ'MİN VƏ ALLAHIN MƏSLƏHƏTİ

İmam Sadiqin (ə) buyuruğunda Əhli-beyt ardıcılları üçün sadalanmış imtiyazlar mütləq deyil, saysız xüsusiyyətlərdən bir neçəsidir. Yə'ni bir insanın başına bulud kölgə salmırsa bu o demək deyil ki, bu şəxs mö'min deyil. Hər şey Allahın məsləhətindən asılıdır. Bu qayda ruzi məsələsinə də şamildir. «Əgər o məmləkətlərin

əhalisi iman gətirib (pis işlərdən) çəkinsəydilər, onların başlarına göydən və yerdə bərəkət yağdırardıq»(۱). Diqqət edin, Allahdan çəkinməkdə nümunə olan xalis .mö'minlərə Allahdan dünya ne'məti yox, onun məsləhətini istəyir



---

.Ə'raf» surəsi, ayə ۹۶» [۲۱] -۱

Rəvayətin davamında imam Sadiq (ə) mö'minləri Əhli-beyt ardıcılları haqqında pis danışmaqdan çəkinməyə, hətta onların günahkarları haqqında yalnız yaxşı sözlər danışıb onların günahdan çəkinməsi üçün dua etməyə çağırır. Bu əxlaqi göstərişə əsasən mö'minlər günahkar din qardaşı ilə əlaqəni kəsib onu cəhənnəm əhli hesab etməməlidirlər. Günaha yol vermiş insanın imanı yerindədirsə onun tövbə edib .bağışlanması üçün dua etmək lazımdır

İnsan öz mö'min qardaşı haqqında yaxşı fikirdə olmalı, onu yol verdiyi günaha görə düşmən hesab etməməlidir. Rəvayətdə buyurulur ki, Allah imanını qorumuş insanı dost tutur. Günahkarın özünü yox, onun yol verdiyi günahı düşmən bilir. Əksinə, imansız insan yaxşı bir iş görərsə Allah onun özünü yox, gördüyü işi dost tutur. Biz də öz növbəmizdə mö'mini dost, onun günahını düşmən bilməli və bu günahdan .uzaqlaşması üçün dua etməliyik

İmam Sadiq (ə) buyurur: «Hər kəs bizim sorağımıza gələrək düşmənlərimizin vilayətini inkar edib bizim vilayətimizi qəbul etsə bildiyini deyib, bilmədiyi şübhəli məsələlərdə .«sussa, bizim şəfaətimizə nail olub behiştə gedər

İnsan soruşulan sualın cavabını bilmədikdə susmalı, cavab verməkdən çəkinməlidir. Elə insanlar var ki, heç

bir dəlili olmadan təsdiq və ya inkar mövqeyində dayanıb. Mö'min özündə cəsarət taparaq bilmədiyi şey haqqında soruşulduqda belə cavab verməlidir: «Bilmirəm. Bu sahədə daha çox biliyi olan mütəxəssisdən soruşun». Əksinə, bir mövzu haqqında .kifayət qədər dəlili olanlar öz mövqelərində möhkəm dayanmalıdırlar

?Əhli-beyt vilayətinin xoşbəxtliyə tə'siri mütləq, yoxsa nisbidir

Bə'ziləri elə güman edir ki, Əhli-beyt vilayətini qəbul edən şəxs nə qədər günaha batsa da bağışlanacaq və bu vilayəti qəbul etməyənlər ... hətta ibadət etsələr də ... cəhənnəmə gedəcəklər. Onların fikrincə imamlar öz şiələrinə şəfaət edərək onların bütün günahlarını bağışladacaqlar. Doğrudanmı imam Hüseynin (ə) əzadarlıq mərasimində ağlamaqla bağışlanmaq olar? Belə düşünən insan günahdan çəkinərmi? ?Belə insan imaməti qəbul etməyənlərə bədbin olmazmı

Əhli-beyt vilayətini qəbul etməyənlərin mütləq cəhənnəmə gedəcəyi haqqında rəvayətin doğruluğuna münasibət bildirmədən bə'zi mühüm nöqtələrə nəzər .salacağıq

## İMAN VƏ ƏMƏLİN SƏADƏTƏ ÇATMAQDA ROLU

Mühüm e'tiqad məsələlərindən biri budur ki, insanın xoşbəxtliyində iman və əməlin rolu nədir? İman və əməlin hər ikisi zəruridir, yoxsa biri kifayətdir? Əsas imandır, ?yoxsa əməl

Qur'ani-Kərim nəzərindən imansız əməl faydasızdır. Bir şəxs Allaha, qiyamətə, peyğəmbərlik və imamətə inanmazsa təkcə yaxşı işləri hesabına axirət səadətinə

qovuşa bilməz. Axı behiştə inanmayan hansı məntiqlə behiştə getməlidir. «Kafirlərin əməlləri səhradakı ilğıma bənzər. Susuzluqdan ürəyi yanan onu su bilər, nəhayət gəlib çatdığı zaman heç nə tapmaz. Tapdığı əməli müqabilində Allahın cəzası olar. Allah da onun cəzasını verər. Allah tez bir zamanda bütün məxluqatının hesabını çəkər»(١).

Xalq adətən yol çəkib, körpü salan varlıları əziz tutur. Amma bu adamların Allaha e'tiqadı olmazsa Allah da onların yaxşı işlərini nəzərə almaz. Sual oluna bilər ki, əgər bütün dünya Lodıgin və Edisonun zəhmətləri hesabına elektrik işığından istifadə edirsə nə üçün onlar cəhənnəmə getməlidir? Cavab belədir ki, bir insana Allah, qiyamət, peyğəmbər və imam sübut olduğu halda inad üzündən qəbul etməzsə, bu insan əbədi ilahi ne'mətlərdən faydalanmaq ləyaqətinə malik deyil. Bir şəxs bilərəkdən hər hansı bir həqiqəti inkar edərsə axirət səadətindən məhrum olar. Belə insan gördüyü xeyir işlərin əvəzini elə dünya həyatında da alar, axirət mükafatındansa məhrum olar.

İslam və Qur'an nəzərincə ilahi biliklərdən xəbərdar insan bilərəkdən bu həqiqətləri inkar edirsə nəinki behiştə getməz, heç onun qoxusunu da duymaz. Əksinə, imanlı olduğu halda heç bir xeyir iş görməyən insan əbədi səadətə qovuşa bilməz. Bəlkə də, bu ehtimal həqiqətdən uzaqdır. Necə ola bilər ki, imanlı insan heç olmasa bir dəfə də Allaha səcdə etməsin. Axı iman insanın həyatında zərrə qədər də olsa tə'sir qoymalıdır. DeməK, həqiqi iman sahibinin heç bir xeyir iş görməməsi



---

١- [٢٢] «Nur» surəsi, ayə ٣٩.

ehtimalı çox zəifdir. Bu yalnız o vaxt mümkün olar ki, insan iman gətirən kimi dünyasını .dəyişsin

Ömür boyu günaha batıb cinayətlərə yol vermiş insan imanlı olduğunu iddia edirsə .şübhəsiz ki, yalan deyir. İmanlı insan xeyir işlərdən uzaq ola bilməz

Əgər saleh əməl imanın şərtidirsə nə üçün mö’minlər günaha yol verir? Əgər imanlı insan günaha batırsa, demək, onun imanı zəifdir. Belə insanda şəhvət və qəzəb oyanan kimi iman yaddan çıxır. Rəvayətə görə günah edən zaman, iman ruhu tərk edir. Həmin an insanı mö’min adlandırmaq olmaz. Onu kafir də hesab etmək düzgün deyil. Çünki qəzəb və şəhvət alovu sönən kimi iman ruhu geri qayıdır. Amma bir günah imanın unudulmasına səbəb olmaqla gündəlik təkrarlanaraq artarsa belə insan üçün kafir olmaq qorxusu vardır. «Nəhayət, Allahın ayələrini yalan hesab edib məsxərəyə qoyanlar kafir oldular»(١). Təbii ki, günah çirkabında qərq olmuş qəlbdə iman ləyaqəti yoxdur. Günah insanın imanını asta-asta zəiflədərək nəhayət, bir gün onu tamamilə .aradan aparır

Əlbəttə ki, xeyir iş görən imanlı insanlar da ehtiyatlı olmalıdırlar. Çünki şəhvət, qəzəb, dünyagirlik, vəzifəpərəstlik hər zaman pusqudadır. İman o zaman səadətə aparır ki, insanın son nəfəsinədək davamlı olsun. Bir ömür imanla yaşayıb ölüm məqamında küfrə düçar olanlar vardır. Hansı ki, ömrünün axır dəqiqələrində həqiqətdən xəbər .tutub tövbə edərək dünyadan imanlı gedənlər də var

Bəs mö’min insan saleh işlər görməklə yanaşı çox günaha batarsa onu hansı tale gözləyir? Əgər bu insan



---

.Rum» surəsi, ayə ١٠» [٢٣]-١

ölümündən qabaq həqiqi tövbəyə nail olarsa bütün günahları bağışlanar. Bə'ziləri nöqsan tuta bilər ki, bu baxış günaha yol açır. Amma kim əmin ola bilər ki, həqiqi tövbəyə nail olacaq?! Hər halda, həqiqi tövbə edə bilən mö'minin günahları bağışlanacaqdır. «Hər kəs tövbə edib yaxşı iş görsə, şübhəsiz ki, gözəl bir dönüşlə .(Allaha tərəf qayıdar»(١)

Ömür boyu böyük günaha yol verməyib yalnız kiçik günahlara batanlar tövbə edəcəkləri təqdirdə bağışlancaqlar: «Əgər böyük günahlardan çəkinsəniz, kiçik günahlarınızın üstünü örtərik»(٢). Onu da qeyd edək ki, bilərəkdən kiçik günahları davam etdirmək böyük günah hesab olunur. Bəs böyük günaha batmış insan tövbə etmədən dünyadan gedərsə necə? Rəvayətə əsasən bu insan çətin can verər, günahı təmizlənməsə bərzəxdə cəzasını çəkər, bu da səmərəsiz olsa qiyamət səhnəsində sıxıntı keçirər. Unutmaq olmaz ki, behiştə yalnız imanı ləkələnməmiş insanlar gedə .bilər

Xəvaric əqidəsində olanlar böyük günaha yol vermiş insanı kafir hesab edirdilər. Ən pisi isə budur ki, onlar İslamda zəruri olan bə'zi əməlləri böyük günah bilirdilər. Elə buna görə də İslam hakimiyyətini zəruri bilən şiələri «kafir» adlandıraraq qətlə yetirirdilər. Bəli, gecə ibadət edib gündüz oruc tutan, Qur'anı əzbər bilən xəvaric bu sayaq əqidə çaşqınlığına düçar olmuşdu. Əslində isə böyük günaha yol vermiş insan tövbə etmədiyi halda əzaba düçar olsa da onu kafir adlandırmaq olmaz. İnsan nə qədər böyük günaha batsa da tövbə edib cəzasını çəkdikdən sonra imanı olduğu üçün .behiştə gedər



---

.Furqan» surəsi, ayə ٧١» [٢۴]-١

.Nisa» surəsi, ayə ٣١» [٢۵]-٢

İmanın neçə sütunu vardır? Həzrət Peyğəmbərin (s) buyuruqlarını qəbul etmək dinin sütunlarındandır. Bu buyuruqların ən mühümü «üsuli-din», yə’ni dinin əsasını təşkil edən tövhid (Allahın birliyi), nübüvvət (peyğəmbərlik) və məad (ölümdən sonra həyat) inamlarıdır. Bəs qalan buyuruqlar necə? Məsələn, əgər bir şəxsdə imam Əlinin (ə) həzrət Peyğəmbər (s) tərəfindən xilafətə tə’yin olunmasına yəqinlik varsa necə? Məsələn, bir şəxs həzrət Peyğəmbərin (s) öz dilindən Əlinin (ə) xilafətə tə’yin olunmasını eşitdiyi halda düşmənçilik göstərərək bu həqiqəti inkar edirsə, onu imanlı hesab etmək olarmı? Əhli-beyt vilayətini inadkarlıq səbəbindən inkar edən şəxs cəhənnəm əhlidir. «Onlar Allahın lə’nət etdiyi şəxslərdir... Yoxsa onlar Allahın öz ne’mətindən bəxş etdiyi şeyə görə insanlara həsəd aparırlar? Halbuki, biz İbrahim övladına da kitab və hikmət vermişdik»(۱).

Fəqihlərin buyuruğuna əsasən dinin zəruri hökmlərini inkar etmək peyğəmbəri inkar etməkdir. Ümumiyyətlə, peyğəmbərin buyuruğunu inad üzündən qəbul etməmək peyğəmbərliyin inkarıdır. Hətta zəruri olmayan hökmün inkarına məntiqi münasibət budursa, Əhli-beytin vilayəti kimi mühüm bir məsələni inad üzündən inkar edəni imanlı hesab etmək olmaz.

Necə ola bilər ki, insan Allahı qəbul edə, amma onun yer üzündəki hakimiyyətini qəbul etməyə?! Yer üzündə Allahın hakimiyyətini icra edən peyğəmbər və imamların inkarı, Allahın hakimiyyətinin inkarıdır. Hətta qəlbinin



---

۱- [۲۶] «Nisa» surəsi, ayə ۵۴.

dərinliyində də bu əqidədə olan insan kafirdir. Naqis, yarımçıq, ləkəli imanla behiştə getmək qeyri-mümkündür. Həzrət Peyğəmbərin (s) hər bir buyuruğu insanı xoşbəxt .edəcək həqiqi imanın tərkib hissəsidir

## DÜŞÜNCƏ ZƏİFLİYİ

Əgər insan elə bir ictimai mühitdə yaşayırsa ki, bu mühit İslam həqiqətlərinin dərk olunmasında bir maneədir, bu insanın aqibəti necə olacaq? Diqqət etsək görərik ki, yer üzündə əksər insanlar üçün ictimai maneələr mövcudur. İslam və Əhli-beyt həqiqətlərinin təbliğ olunduğu cəmiyyətdə yaşayanlar Allaha şükr etməli və həqiqi iman qazanmaq üçün səʼy göstərməlidir. İslam və Əhli-beytdən uzaq ideyaların təbliğ olunduğu cəmiyyətlərdə əksər insanların heç ağlına da gəlmir ki, əsl həqiqət tamam başqa yerdədir. Həmin cəmiyyətlərdə nəinki həqiqət təbliğ olunmur, üstəlik İslam və Əhli-beyt yoluna qaralar yaxılır. Bir çox ölkələrdə şiələr müşrik kimi təqdim edilir, onların hansısa xüsusi bir Qurʼana eʼtiqad etdikləri bildirilir. Hətta bəʼzi ölkələrdə belə uydurma rəvayətlər danışılır ki, guya şiələr Cəbrail mələyin xəyanət edib imam Əliyə (ə) göndərilən vəhyi həzrət Məhəmmədə (s) gətirməsini iddia edirlər. Guya şiələr namazı bitirdikdən sonra üç dəfə «Əllahu əkbər» əvəzinə üç dəfə «Cəbrayıl xəyanətkardır» deyirlər. İnsanları bu böhtanlara elə inandırıblar ki, min dəfə and içsək .də əhəmiyyət verən olmaz

Yaxşı, belə bir şəraitdə yaşayan insan Əhli-beyt vilayətini qəbul etmirsə o, behiştə gedə bilərmi? Axı rəvayətlərdə buyurulub ki, Əhli-beyt vilayətini qəbul etməyənlər cəhənnəmə gedəsidir. Cəmiyyətin aşıladığı düşüncə tərzindən qeyri bir düşüncə tərzinə əli

çatmayan, həqiqəti dərk etmək gücündə olmayan insanlar İslamda «müstəz’əf» adlanır. Müstəz’əf düşüncə zəifliyinə məhkum insandır. Onun inamı və əməlləri düşüncəsinin zəifliyi qədər üzürlüdür. Bu insanlara əqli və nəqli yolla həqiqətlər sübut .olduqca üzr aradan qalxır. İnsan həqiqəti anladığı dərəcədə də məs’uliyyət daşıyır

Bəli, insanın səadəti onun son nəfəsədək qorunmuş imanından asılıdır. İman isə yalnız o vaxt son nəfəsə qədər qorunur ki, insan daim ona nəzarətçi olsun. Əks təqdirdə iman elə asta-asta zəifləyir ki, insan nə vaxt kafir olduğunu hiss etmir. Hansı ki, ardıcıl .şəkildə diqqət etsəydi qəlbindəki şəkk-şübhələrə cavab tapıb imanını qoruyardı

Yaxşı, bəs düzgün e’tiqadlı insanlar günaha yol verdikdə onlarla necə rəftar edək? Axı bütün insanlar mə’sum ola bilməz. Sözsüz ki, açıq-aşkar günah edən insanlarla yaxınlıq etmək olmaz. Çirkin sifətlərə malik insanla dostluq nəticəsində, insan bu çirkin sifətlərə yoluxa bilər. Amma onun haqqında pis danışmaq olmaz. Əksinə, ona ürək yandırıb tərbiyələnməsinə çalışmaq lazımdır. Onun günahdan uzaqlaşıb tövbə etməsi .üçün dua etməyimiz yaxşı olar

Deмək, imanını qoruyan insan əvvəl-axır behiştə gedər. Əlbəttə ki, günahlarının cəzasını aldıqdan sonra! «Kim zərrə qədər yaxşı iş görmüşsə bu işin xeyrini, kim zərrə .(qədər pis iş görmüşsə bu işin zərərini görəcəkdir»(١

Bütün işlər nəzərə alınacaqdır. Əhli-beytin şəfaətinə o qədər ehtiyaclıyıq ki, bu şəfaətə (çatmaq ləyaqətini itirməmək üçün günahdan qorunmalıyıq. İmam Sadiq (ə



---

.Zilzal» surəsi, ayə ٧-٨» [٢٧] -١

ömrünün son anlarında belə buyurdu: «Namazı yüngül sayan bizim şəfaətimizə nail olmaz»(۱). Tövbə insanın günahını bağışlatdırdığı kimi, bə'zi pisliklər də insanı şəfaət ləyaqətindən məhrum edir.



---

۱- [۲۸] «Biharul-ənvar», cild ۸۲, səh. ۲۳۵.

İmam Sadiq (ə) İbn Cündəbə buyurur: «Öz əməllərindən arxayın olan insan həlak olar. Allahın rəhmətinə ümid edərək açıq-aşkar günaha batan şəxs nicat tapmaz». İbn Cündəb soruşur ki, bəs kim nicat tapar? Həzrət cavab verir: «Ümid və qorxu arasında olanlar (yə’ni nə günahlarının bağışlanmasından ümidsiz olacaq dərəcədə qorxar, nə də günaha batacaq dərəcədə bağışlanma ümidində olarlar). Onların qəlbləri sanki bir quş caynağındadır (Hər an sıxılmaq və hər an da qurtuluş ehtimalı var). Qəlblərində savaba şövq və əzabdan da qorxu var».

Mə’sumlardan nəql olunmuş rəvayətə görə mö’minin qəlbində iki nur vardır: qorxu və ümid nuru. Onlar tərəziyə qoyularsa biri o birindən ağır gəlməz(١). İnsanın ixtiyari olaraq bir iş görməsi üçün hökmən stimul, səbəb lazımdır. Filosofların tə’birincə, insanı fəaliyyətə vadar edəcək psixoloji durum olmalıdır. İnsanın bir işi görməsi və ya bir işdən çəkinməsi üçün ləzzət və dərd hissləri mühüm səbəblərdəndir. Əgər insan bir işi görməklə ləzzət duyacağına əmin olsa böyük ümidlə bu işə girişəcək. Əksinə, narahatlıqdan qurtulmaq üçün insan bütün işlərdən əl çəkməyə hazırdır. Amma ləzzətə çatmaq və dərddən qaçmaq üçün müqəddimə olmalıdır. Məsələn, insan səhərdən axşamadək işləyərək bir tikə çörək qazanıb bu çörəyi yeməkdən ləzzət almaq ümidindədir. Filosoflar zəhmət çəkməklə əldə olunan ləzzətləri «nəf’» adlandırırlar. Onlar deyir ki, yemək



---

١- [٢٩] «Biharul-ənvar», cild ٧٠.

xeyirli dərman kimidir. Yə'ni yemək özü ləzzətli olmayıb, sadəcə, sağlamlıq üçün müqəddimədir. Amma bə'zən işlərin yerinə yetirilməsi üçün stimul nə ləzzətdir və nə də nəf'. Məsələn, xəstəxana tikməkdə nə ləzzət, nə də nəf' vardır. Sadəcə, bu iş məsləhətdir. Amma bu işi görən şəxs xəstələrin ağrı və ölümdən qurtardığını görəndə .ləzzət duyur. Təhsil və ibadət də bu sayaq işlərdəndir

Demək, hər bir canlı varlıq istədiyinə çatmaq və ya istəmədiyindən uzaqlaşmaq üçün iş görür. Lakin elə işlər vardır ki, insan ona nail olmaq üçün heç bir təlaş göstərmir. Məsələn, insanın nəfəs almağa ehtiyacı var. Amma o, bundan ötrü heç bir əziyyət .çəkmir. Elə istəklər də vardır ki, ona çatmaq üçün hökmən bir iş görməlisən

Amma elə işlər də var ki, insan onu arzulasa da heç vaxt ardınca getmir. Necə ola bilər ki, insan arzusunda olduğu işin ardınca getməyə?! Bəli, insanın bir işə girişməsi üçün hökmən ümid lazımdır. Bir işin düzəlməsinə insanın qəlbində ümid yoxdursa çətin ki, durub fəaliyyətə başlasın. Hər hansı bir işin tərk olunması üçünsə qorxu hissi olduqca .zəruridir

Demək, insanın ixtiyari olaraq bir işi yerinə yetirib, o birindən çəkinməsi üçün ümid və qorxuya ehtiyacı vardır. Ümid və qorxu amilinin iki forması vardır. İnsan yaxşı işə çatmağa və pis işdən qurtulmağa ümidli ola bilər. Məsələn, sağlamlığın əldə olunması və xəstəlikdən qurtulmaq üçün də ümid lazımdır. Anoloji olaraq insan sağlamlığını .itirməkdən, eləcə də xəstəliyə yoluxmaqdan qorxa bilər

İnsan qəlbindəki ümid və qorxu onun düşüncəsi, agahlığı ilə əlaqəlidir. Məsələn, üç yaşlı körpə ilə qırx yaşlı yetkin insanın uyğun hissləri tamamilə fərqlənir. Üç yaşlı körpəni nə beynəlxalq münasibətlərdəki gərginliklər, nə də qiyamət sorğusu narahat edir. Adətən, yaşlı insanlar xəstəlikdən, kasıblıqdan qorxduqları halda, gənclər gələcəkdə güclü və varlı olmağa ümid edirlər. Mə'rifətli, düşüncəli insanlar isə mə'nəviyyat məsələsinə xüsusi fikir verir, ağıl və inamı itirməkdən qorxurlar. Axirətə inanan insanlar behişt ne'mətlərinə ümidli olmaqla yanaşı, cəhənnəm əzabından .xoflanırlar

İslam dini ümid və qorxu dairəsinin daha geniş olduğunu bildirir. Dünya ne'mətləri dalınca qaçıb təkcə xəstəlik, kasıblıq, zəlzələ, ildırımdan qorxan insanı daha qorxulu şeylərdən xəbərdar edir. İnsan üçün mə'nəviyyatını əldən verib Allahın qəzəbinə düçar olmaq daha qorxuludur. İmanın müxtəlif mərtəbələrində insanın ümid və qorxu hissi də müxtəlif olur. İmanın birinci pilləsində olanlar cəhənnəm əzabından qorxduğu halda, üstün iman dərəcəsində olanlar Allahın razılığını itirməkdən xoflanırlar. Uşaqlar da buna oxşar hiss keçirir. Bə'zi uşaqlar ata-ananın verəcəyi cəzadan, bə'ziləri isə onları narazı salmaqdan çəkinirlər. Saf təbiətli körpələr üçün valideynin soyuq münasibətindən ağır cəza yoxdur. Allahın e'tinasızlığından qorxu insanın fitri hissidir. Allahın öz bəndəsindən üz döndərməsi Qur'ani-Kərimdə ən böyük əzablardan biri kimi təqdim olunur: «Allah qiyamət günündə onları dindirməz, onlara nəzər

.salmaz»(١). Çoxları bu əzabın necə ağrılı olduğunu dərk etmir

Deməkم, qorxu və ümid təkcə dünya işlərinə adi deyildir. Həqiqi səadət arzusunda olan .insan əbədi axirət həyatını unutmamalıdır

## ALLAHDAN QORXU VƏ ÜMİD İNSANLIĞA TƏRƏF HƏRƏKƏTİN AMİLİDİR

Əgər insan müəyyən bir işdən çəkinirsə bu işdə tə'sirli şəxslə hesablaşmalıdır. Məsələn, axirət əzabından qorxan insan Allahı tanımalı və Ondan çəkinməlidir. Necə ola bilər ki, xərçəngdən, vəbadan qorxan insan bu bəlaların sahibi ilə hesablaşmaya?! Əslində insanın onu xoşbəxt və ya bədbəxt etmək qüdrətində olan Allahla .hesablaşması tam təbiidir

Bə'zən elə olur ki, ölümdən sonrakı həyata, cənnət və cəhənnəmə inanan insan Allahı tanımır. Arxeoloji tədqiqatlar nəticəsində mə'lum olmuşdur ki, qədim insanlar arasında axirətə inananlar olmuşdur. Onlar öz ölülərini dəfn edərkən qəbirə ərzaq .qoyar və bununla da ölüləri axirət həyatında aclıqdan qurtarmaq istəyərdilər

İslam dinində əsas məqsəd diqqəti cənnət və cəhənnəmə yox, varlıq aləminin ixtiyar sahibi olan Allaha yönəltməkdir. Cəhənnəm odundan qorunmaq istəyən ömür boyu Allahdan çəkinməmişsə onu zirehli halda qəbirdə dəfn etməyin heç bir faydası yoxdur. İnsanın yeganə qorxu və ümid nöqtəsi Allah olmalıdır. Dünya və axirətdə bəlalardan qorunmaq istəyən şəxs Allahın razılığını qazanmaq üçün çirkin işlərdən çəkinməlidir. .Yeganə səadət yolu Allaha itaətdir



---

.Ali-imran» surəsi, ayə ٧٧» [٣٠] -١

İslam nəzərincə insanlığa doğru hərəkətdə qorxu və ümid mühüm amildir. Bu iki amil səbəbindən insanlar öz iman mərtəbəsinə uyğun ibadətlə məşğul olur. Bə’ziləri cəhənnəm əzabı qorxusundan, bə’ziləri isə Allahı razı salmaq xatirinə ibadət edir. «Kumeyl» duasında oxuyuruq: «Tutaq ki, əzabına səbr etdim, bəs ayrılığına necə səbr .«?edim

## QORXU VƏ ÜMİDİN HƏDDİ

Ümid və qorxunun faydalı həddi və bu həddin mərtəbələri vardır. Mö’minin hissləri bu .mərtəbələrdən birinə uyğun olmalıdır

İnsan Allahın mərhəmətinə həddən artıq ümid edirsə, bağışlanacağına arxayın olub böyük günahlara bata bilər. Bu həqiqi ümid deyil və olduqca zərərlidir. Çünki Allah insanı onun hansısa əməlinə görə bağışlayır. İnsan Allahdan elə bir həddə qorxmalıdır ki, bu qorxu onu günahdan çəkindirə bilsin. Qorxu və ümid arasında tarazlıq olmalıdır. Ümid qorxudan çox olsa insan günaha düşər, qorxu ümiddən çox olsa insanda .bədbinlik yaranar

İman dərəcəsi yüksək olan bir qism mö’min bə’zən öz gələcək taleyindən xəbərdar .olur və axirət aləminin gerçəklikləri onların qəlbini titrədir

## QORXU VƏ ÜMİD ARASINDA TARAZLIQ

Kamil insanın bəndəlik hissi onun bütün vücudunu bürüyür. İnsanın qorxusu bu vücuda daxildir. Deməк, mə’sum imamlarda, günahsız insanlarda da qorxu olmuşdur. Bu insanlar Allahın mərhəmətindən xəbərdar olsalar da Onun qəhr sifətlərini xatırlayaraq qorxudan özlərini unudurlar. Amma Allahın camal sifətləri

haqqında düşünmək onlara ümid verir. Əlbəttə ki, bu mərtəbədə bə’zən isə ümid qorxunu üstələyə bilər. Kamil insanlarda isə ümid və qorxu arasında dəqiq tarazlıq .vardır

Bu mövzu ilə əlaqədar maraqlı bir rəvayət nəql olunmuşdur. Təqribən yaşıd olan həzrət Yəhya (ə) və həzrət İsa (ə) eyni dövrdə yaşamışlar. Bir gün Yəhya (ə) İsadan (ə) soruşur: «Necə də sakitsiniz. Yoxsa ilahi əzabdan qorxmursunuz?». Həzrət İsa buyurdu: .«?« Nə üçün bu qədər ağlayırsınız? Məgər Allahın mərhəmətinə ümidiniz yoxdur

Həzrət Yəhya daim Allah qorxusundan ağlayardı. Hətta atası Zəkəriyya məsciddə moizə etmək istəyərkən baxardı ki, Yəhya orada olmasın. Həzrət Yəhyada qorxu həzrət İsada isə ümid hissi daha güclü idi. Amma bu iki sifət mə’sum imamlar və həzrət Məhəmmədə (s) eyni dərəcədə olmuşdur. Onlar Allahın cəlal sifətlərini düşündükdə qorxar, camal sifətlərini düşündükdə isə ümidvar olardılar. Bu hal digər .övliyalarda da müşahidə oluna bilər

Mö᾽təbər dini mənbələrdə bildirilir ki, mö᾽mini sevindirmək böyük ibadətdir. Allah yanında ən sevimli ibadətlərdən biri insanın öz mö᾽min qardaşını sevindirməsidir. İmam Baqir (ə) buyurur: «Allah yanında ən sevimli ibadət mö᾽minin qəlbini şadlandırmaqdır»(١). Əhli-beytdən nəql olunmuş hədislərdə buyurulur ki, mö'min bir şəxsi sevindirən Əhli-beyti sevindirir, Əhli-beyti sevindirən isə Allahın Rəsulunu şad edir(٢). Bu sayaq təşviqedici rəvayətlər çoxdur və onlardan birində imam Sadiq (ə) belə buyurur: «And olsun Allaha ki, bir mö'min qardaşını sevindirən kəs bizi sevindirmiş, Allah rəsulunun qəlbini şad etmişdir»(٣). Həmin mənbədə nəql olunmuş digər bir hədisdə həzrət Peyğəmbər (s) buyurur: «Mö᾽mini sevindirən bizi şad edir, bizi şad edən isə Allahı sevindirir».

Mö᾽mini sevindirməyin kifayət qədər bəyənilmiş bir iş olduğuna heç bir şübhə qalmır. Amma yenə də suallar doğur. Əgər insan istənilən bir şəxsi istənilən bir yolla sevindirsə bu onun üçün ibadət hesab oluna bilərmi? İslam maarifi ilə tanış olanlar üçün bu sualın cavabı aydındır. Aydındır ki, günaha batmaqla başqasını sevindirmək olmaz. Əgər insan öz mö᾽min qardaşını günah yolla şad edərsə nəinki savab qazanmaz, hətta günaha batar. İslam alimlərinin nəzərincə hətta mə᾽nasız işlərlə, zarafatla, məsxərəbazlıqla mö᾽mini sevindirmək



---

١- [٣١] «Üsuli-Kafi», cild ٢, səh. ١٨٨.

٢- [٣٢] «Biharul-ənvar», cild ٧۴.

٣- [٣٣] «Üsuli-Kafi», cild ٢, səh. ١٨٢.

bəyənlilməyən işdir. Əlbəttə ki, istisnalar da ola bilər. Əgər bir mö’min hansısa ruhi sarsıntılardan bədbinləşmişsə onu bu vəziyyətdən çıxarmaq üçün zarafat, baməzəlik etmək olar. Bir daha qeyd edək ki, bu istisna xəstənin müalicəsi üçün nəzərdə tutulur. Adi hallarda «Mö’minun» surəsində buyurulduğu kimi mö’min mə’nasız işlərdən .çəkinməlidir

İkinci bir tərəfdən hər insanı yox, yalnız mö’mini sevindirmək ibadətdir. Zalım və kafir .insanla münasibətlərdə isə məhdudiyyətlər vardır

**ŞADLANMAQ FİTRİ İSTƏKDİR**

Bu mövzuda daha dərin və mürəkkəb suallar vardır. Ümumiyyətlə, İslamda şadlığa münasibət necədir? İnsan üçün şadlanmaq, yoxsa qəmlənmək daha faydalıdır? Hüznün tə’rifi haqqında rəvayətlər çoxdur. Rəvayətə görə, məclisdə bir insanın məhzunluğu bütün məclis əhlinə mərhəmətə səbəb olar. Əgər şadlanmaq faydalı ?deyilsə, nə üçün mö’mini sevindirmək savab əməl hesab olunur

Şəksiz ki, insanın fitrətində şadlanmağa meyl var. Qiyamət günü möminlərə əta olunacaq nemətlərdən biri şadlıqdır. «Ğaşiyə» surəsinin ۸-ci ayəsində oxuyuruq: «O gün bir çox üzlər sevinəcək». «İnşiqaq» surəsinin ۹-cu ayəsində buyurulur: «O, (mömin) ailəsinin yaxınlarının yanına sevinclə qayıdacaqdır». Sevinc mənfi hiss deyildir. Behiştə daxil olanlar deyəcək: «Qəm-qüssəni bizdən uzaq edən Allaha həmd olsun!»(۱) Bəli, şadlıq fitri istək, qəm-qüssə isə cəhənnəm əzablarındandır. «Zumər» surəsinin ۶۰-cı ayəsində buyurulur: «Allaha qarşı yalan



---

.Fatir» surəsi, ayə ۳۴» [۳۴] -۱

uyduranların üzlərini qiyamət günü qapqara görərsən». Əksinə, Allahın rəhmətinə qoşulmuş şəhidlər haqqında buyurulur: «Onlar Allahın öz mərhəmətindən bəxş etdiyi nemətə sevinir, hələ onlara çatmamış (şəhid) kəslərin heç bir qorxusu olmayacağına (və qəm-qüssə görməyəcəklərinə görə şadlıq edirlər» (١)

İnsan fitrətən şadlıq sorağındadır. Dünya həyatı sevinc və kədərsiz ötüşmür. Kimsə ömür boyu sevinc duymadığı kimi, kimsə də ömrünün sonunadək qəm-qüssə içində qalmır. Təbii olaraq şadlıq ardınca gəzən insan məqsədinə çatmaq üçün müxtəlif yollar axtarır. Bə'zən insan bir saat şadlıqdan ötrü günaha batır və ömrünün bütün qalan hissəsini həmin şadlığın əzabını çəkir. Məsələn, narkotik maddələrdən, spirtli içkilərdən duyulan şadlıq müvəqqətidir. İnsan ağlı bu sayaq sevinci qəbul etmir. Şəxsiyyəti, ailəni və cəmiyyəti bədbəxtliyə sürükləyən bu cür saxta şadlıqlara bəraət qazandırmaq olmaz. İslam dini o şadlığı qəbul edir ki, bu şadlıq insanı əbədi səadətdən məhrum etməsin. Əgər dünya sevinci əbədi axirət sevincinə qənim kəsilməyibsə onu qəbul .etmək olar

Bəs dinə zidd olmayan şadlıqlar hansıdır? Əvvəla, onu qeyd edək ki, ifrat qəm-qüssəyə batıb bədbin olmuş insan nə özü, nə ailəsi, nə də cəmiyyət üçün xeyirli ola bilər. Belə bir insan nə dünya, nə də axirət həyatı üçün çalışmaq iqtidarında deyil. Belə insan küfrə batıb özünü öldürə də bilər. Bu sayaq ifrat qəm-qüssə İslam dinində pislənilir. Amma insanın dünya və axirət səadətini tə'min edən şadlıqlar müsbət qiymətləndirilir. ,Bir şadlıq ki



---

١- [٣٥] «Ali-imran» surəsi, ayə ١٧٠.

.insanı təhsilə, ibadətə və zəhmətə həvəsləndirir, bu şadlıq din tərəfindən təqdir olunur

Deməik, dünya həyatına aid olan ifrat şadlıqlar məqbul hesab edilmir. «Hud» surəsinin ۱۰-cu ayəsində oxuyuruq: «Başına gələn müsibətdən sonra ona rahatlıq nəsib etsək, sevinərək deyər ki, artıq fəlakətlər məndən sovuşdu». Həddini aşmış Qarun haqqında isə belə buyurulur: «Qövmü Qaruna belə dedi: Sevinmə, şübhəsiz ki, Allah qürrələnib .(sevinənləri sevməz»(۱

Bu sayaq şadlıqlar bəyənilmir. Çünki bu şadlığın nəinki təkamülə heç bir xeyri yoxdur, hətta onu yuxuya verib hərəkətdən saxlayır. Hətta Qur'anda buyurulur ki, dünyada .(çox sevinənlərin axirətdə vəziyyəti çətin olur(۲

## BƏYƏNİLMİŞ HÜZN

İnsanın diqqətini Allaha, axirətə, dini və ictimai vəzifələrə yönəldən qəm-qüssə faydalıdır. Əgər insan vəzifəsini yerinə yetirə bilmədiyi, günaha batdığı üçün qəmgin olursa, bu qəmginlik çox faydalıdır. Amma bu hüzn ifrat olmamalıdır. Hüznün elə bir həddi vardır ki, insanı bədbinləşdirib fəaliyyətdən saxlayır. İnsan qəm dəryasına qərq olub təhsildən, ibadətdən, vətənə xidmətdən dayanırsa, bu qüssənin nə faydası ola .bilər?! Bir sözlə, insanı səadətə aparan hüzn bəyənilmişdir

## İSTƏYƏ ÇATMAQ SEVİNCDİR

İnsan o zaman sevinir ki, arzusu həyata keçsin. Amma insanların arzu-istəkləri müxtəlifdir. Məsələn, bir uşağı sevindirmək üçün ona oyuncaq vermək kifayətdir. Bir az



---

.Qəsəs» surəsi, ayə ۷۶» [۳۶] -۱

.İnşiqaq» surəsi, ayə ۱۳» [۳۷] -۲

böyüdükdən sonra maraqlı nağıllar danışmaqla onu sevindirmək olar. Lakin yeniyetmələri şadlandırmaq üçün oyuncaq və şirin nağıllardan istifadə etmək əbəsdir. Onlar öz şəxsiyyətləri haqqında xoş sözlər eşitdikdə fərəhlənirlər. Bə'zən bu istək ifrata varır və yeniyetmə yeri gəldi-gəlmədi özünü göstərmək istəyir. Yaş artdıqca istəklər də dəyişir. Amma dadlı yemək, gözəl geyim, rahatlıq bütün yaşda olanları .sevindirir

## İSLAM DİNİNDƏ ŞADLIQ

İnsanın mə'nəvi təkamülünə yardımçı olan bütün şadlıqlar İslam dinində bəyənilir. Elə ruhani insanlar vardır ki, yalnız Allaha ibadət edərkən sevinirlər. Belə insanları şad etmək üçün onlara ibadət şəraiti yaratmaq lazımdır. İmam Səccad (ə) minacatlarının birində belə ərz edir: «Allahım səninlə ünsiyyətdən kənarda duyduğum ləzzətlərə görə tövbə edirəm. Səninlə görüşdən kənardakı sevinclər mənə günahdır. Belə şadlıqlardan Sənə pənah aparıram». Bəli, belə insanları sevindirmək üçün onların qarşısındakı maneələri aradan qaldırmaq lazımdır. Belə insanları sevindirməyin çox böyük savabı .vardır. Çünki beləəri yalnız Allahla ünsiyyətdən ləzzət alırlar

Belə də ola bilər ki, insan şadlanmaqla günahdan uzaqlaşa. Məsələn, ailədə şadlıq varsa, bu şadlıq ərlə arvad arasında mehribanlıq yaradır və onların kənarda günaha .düşməsinin qarşısını alır

Mö'min insanın dünya sevinci onun ibadətinə yardımçı olmalıdır. İslam dinində yorğunluğun qarşısını almaq üçün səfərdə olan insanlarla zarafat etmək icazəsi verilir. .Amma bu zarafat ifrata varmamalı, ətrafdakılar üçün narahatlıq yaratmamalıdır

Deməks, imam Sadiqin (ə) buyurduğu hədisdə mö'mini sevindirmək nəzərdə tutulur. Mö'mini isə günahla sevindirmək olmaz. İnsanlar müxtəlif iman mərtəbələrindən olduğundan onları eyni bir işlə sevindirmək çətindir. Yetkinlik yaşına təzə çatmış mö'mini psixoloji sarsıntıdan çıxarmaq yaxşı iş hesab olunur. Aydın məsələdir ki, imam Hüseyn (ə) üçün qurulmuş əzadarlıq mərasimində ağlamaq faydalı olduğu üçün əzadarı hüzndən ayırmaq olmaz. Gecə yarı Allahla raz-niyaz edərkən ağlayan insana mane olmaq lüzumsuzdur. Çünki bu iki halda qəm-qüssə mə'nəvi yüksəlişə .yardımçıdır

Mümkündür ki, bə'ziləri öz nəfs istəklərini doyurmaq üçün bu hədisdən sui-istifadə etsinlər. Onlar deyib-gülür, zarafatlaşır və bəhanə gətirirlər ki, mö'mini sevindirmək savabdır. Hansı ki, mö'mini sevindirmək o zaman savabdır ki, bu iş onun imanını .artırsın

Bu dünyada insanlar üçün çeşidli çətinliklər vardır: xəstəlik, kasıblıq, itki, zəlzələ, sel, tufan və s. Bu çətinlikləri yaşayıb bədbin olmuş insanları sevindirib normal həyata .qaytarmaq, onları ibadətə həvəsləndirmək böyük savabdır

Əxlaq alimləri çox yatmaqla çox danışmağı insanın təkamül yolunda ciddi maneələr hesab edirlər. Məsələn, çox yemək kimi digər manelər də vardır. Bu sadalananlar ləzzətli olduğu üçün insanın diqqətini cəlb edir. Əslində isə zəruri ehtiyacdan artıq yatmaq, danışmaq, yeməyin, hətta dünya həyatı üçün də heç bir faydası yoxdur. Bu işlər insanın qiymətli vaxtını əlindən alıb onun dünyəvi işlərinə ciddi zərbə vurur. İnsan çox yeməklə və yatmaqla vaxt itirir, çox danışmaqla enerji itkisinə mə'ruz qalır. Vəzifəsinin tərkib hissəsi danışmaqdan ibarət olan müəllimlərin, natiqlərin fiziki cəhətdən zəifliyi deyilənlərə sübutdur. Bu insanlar danışıb qurtardıqdan sonra möhkəm yorğunluq hiss edirlər. Sözsüz ki, çox danışmaq məzəmmət olunarkən insanlara elm öyrədib doğru yolu təbliğ edənlər nəzərdə tutulmur. Söhbət boş yerə çox danışmaqdan gedir. Vacib olmayan yerdə danışmaq bə'zən insanı cəhənnəmə də apara bilər. İnsan üçün böyük günah hesab olunan qeybət, böhtan söz gəzdirmə çox .danışmağın nəticəsidir. Çox danışmağa adət etmiş insan üçün bu iş ləzzət verir

İmam Sadiq (ə) Əbdullah ibn Cündəbə buyurur ki, gecələr az yat, gündüzlər az danış. Həzrət sözünün davamında həzrət Süleymanın anasının ona dediklərini xatırladır: «Çox yatmaq səni kasıb edər». Əgər yatmaqda məqsəd yorğunluğu aradan qaldırıb yeni qüvvə əldə etmək deyilsə, belə yuxu faydasızdır. Ömür o qədər də

uzun deyil ki, insan onu faydasız yuxularla puça çıxarsın. Ömürün qədrini bilən çox ?yatarmı

Çox danışmağa vərdiş edən insanlar özünə nəzarət etməkdə çətinlik çəkir. Belə .adamlar üçün susmaq zindanda oturmaq kimidir

İmam Sadiq (ə) buyurur: «Bədən üzvləri arasında göz və dil qədər naşükrü yoxdur». Hər bir üzv insanın ona göstərdiyi xidmət müqabilində xidmət göstərir. Amma göz və dil belə deyil. Çox vaxt yuxuda olan göz, boş yerə enerji sərf edən dilin faydası nədir?! Amma nurunu təhsilə sərf edən gözün, ibadətə məşğul olan dilin xidmətini inkar .etmək olmaz

## İFRAT VƏ TƏFRİT YUXUDAN PƏHRİZ

Ümumiyyətlə, insan ifrat və təfritdən çəkinməli, bütün işlərdə orta həddi gözləməlidir. Bə'zən insan az yatmağın faydaları haqqında eşidib yuxu müddətini o qədər azaldır ki, öz sağlamlığını təhlükəyə atır. İnsan orqanizmi istirahətə möhtacdır. Qur'ani-Kərimdə ilahi ne'mət olan yuxu haqqında buyurulur: «Biz yuxunu sizin istirahətiniz üçün .(müəyyən etdik»(١

Bə'zi insanlar yuxusuzluqdan əziyyət çəkir. Onlar bunun qarşısını almaq üçün müxtəlif dərman perepartlarına aludə olurlar. Bu aludəçiliyin mənfi nəticələri gizli deyil. Ona görə də insan təbii yuxunun qədrini bilməlidir. Qədərindən artıq yatmaq normal həyat .fəaliyyətini korlayır

Ayrı-ayrı insanların yuxuya olan ehtiyacı müxtəlifdir. Zəruri yuxu müddətinin tə'yinində insanın yaşı, peşəsi, sağlamlıq vəziyyəti mühüm şərtlərdəndir. Hər bir insan



---

.Nəbə» surəsi, ayə ٩» [٣٨] -١

ya şəxsi təcrübəsi, ya da həkim göstərişi əsasında nə qədər yatmalı olduğunu daha .yaxşı bilir. Normal yuxu rejimi qurmayanlar sonralar bunun əziyyətini çəkir

İslam dinində gecə yarı ibadət etmək tövsiyyə olunur. Amma gecəni bir müddət oyaq qalmaq əsas vermir ki, insan gündüz çox yatsın. Çünki gecə yatıb gündüz işləmək təbiidir. Yer kürəsinin bə'zi nöqtələrindən bir neçə ay gecə, bir neçə ay gündüz olur. Uyğun məntəqələrdə yaşayanlar yuxu və iş rejiminə ciddi əməl edirlər. Əksər məntəqələrdə isə gecə və gündüz bu işdə insanlara köməkçidir. «Muzzəmmil» surəsinin ۶-۷-ci ayələrində buyurulur: «Şübhəsiz ki, gecə qalxmaq daha əlverişli və söz demək .«(dua) daha münasibdir. Çünki gündüz sənin uzun-uzadı davam edən işlərin vardır

Bəli, gecə yuxu üçündür. Bununla belə, insan yuxuya olan ehtiyacını müəyyənləşdirməlidir. Gün batandan gün doğana dək yatmaq zəruri hesab olunur. Allah-təala öz peyğəmbərinə buyurur: «Gecənin az bir hissəsi istisna olmaqla qalxıb namaz qıl»(۱). Ayədən göründüyü kimi insan, orqanizm üçün az miqdar yuxu kifayət edir. «Zariyat» surəsinin ۱۷-ci ayəsində oxuyuruq: «Onlar (müttəqilər) gecələr az .yatırdılar». Əgər insan günün yarısını yatmalı olsaydı, Qur'an uyğun ayəni buyurmazdı

### YUXU REJİMİ

Əgər rəvayətlərdəki göstərişlərə əməl etsək, az yatmaqla yuxuya olan ehtiyacımızı tə'min edə bilərik. Yuxunun əsas hissəsini gecə yarıdan əvvələ salmaq çox faydalıdır. Təəssüf ki, bu günki həyat şəraiti yuxunun əsas hissəsini gecə yarıdan sonraya .saxlamağa vadar edir



---

.Muzzəmmil» surəsi, ayə ۲» [۳۹] -۱

Peyğəmbər (s) və mə'sum imamlar dövründə əksəriyyət dini göstərişlərə əməl etdiyindən, gecənin proqramı belə idi: məğrib namazını cəmiyyətlə qılıb evə gedərdilər. Şam yeməyini yeyib işa namazını qılmaq üçün məscidə qayıdardılar. Məsciddən qayıdıb yatardılar. O dövrün həyat şəraiti belə bir proqramın gerçəkləşməsi üçün yardımçı idi. Məsələn, elektrik olmadığından gecənin qaranlığı tez yatmağa səbəb .olurdu

Gecənin əvvəl vaxtında yatmaqla yuxuya olan ehtiyac ödənir, insan rahatcasına yuxudan oyanıb sübh namazını qılır. Təbii ki, gecə yarıyadək televizora baxan insan .üçün sübh namazına durmaq problemə dönür

Bir zaman müsəlmanlar gecə yuxusuz qaldıqda gündüz günortadan qabaq yarım saat yatardılar. Bu yuxu «qəylulə» adlanardı. Bu yorğunluğu aparar, günorta namazı üçün xoş əhval-ruhiyyə yaradardı. Belə bir rejim az yatmaqla yuxuya olan ehtiyacı tə'min .etməyə imkan yaradır

Bu günki həyat şəraiti fərqli olsa da insan proqram tutmaqla vaxtdan səmərəli istifadə edə bilər. İnsan öz vaxtını çox vaxt səmərəsiz, bə'zən isə günaha səbəb olan filmlərin tamaşasına sərf etməməlidir. Xüsusi ilə tələbələr nəzərə almalıdılar ki, gecənin əvvəl vaxtı mütaliədən gecənin sonundakı mütaliə daha faydalıdır. Gecə yarıdan gündoğanadək olan müddətdə insanın zehni aydın olduğundan həmin vaxtda mütaliə, .eləcə də, gecə namazı və Qur'an qiraəti üçün münasib fürsət yaranır

Əsas məsələ az yatmaq yox, səmərəli işlər üçün daha çox vaxt əldə etməkdir. Əgər insan gecəni oyaq qalıb faydasız və günah işlərlə məşğul olacaqsa, şəksiz ki, oyaq ,qalmağa dəyməz. «Gecənin bir qismində Ona səcdə et

.(Ona həmd oxu»(۱). «Gecənin bir vaxtı durub sənin üçün faydalı olan gecə namazı qıl»(۲

Rəvayətə görə İslam Peyğəmbəri (s) gecələr bir neçə dəfə oyanarmış. Mö'minlər üçün müstəhəbdir ki, gecə yarıdan keçmiş oyanıb dörd rək'ət nafilə namazı qılıb yatsınlar. Sonra yenidən durub daha dörd rək'ət nafilə qılsınlar... Sözsüz ki, belə bir proqram hər mö'minin qüvvəsi daxilində deyil. Bə'ziləri gecə namazına durduğu üçün sübh namazını qəzaya verir. Belə olmaz. Ömrünü hədərə vermək istəməyənlər oyaq qaldıqları vaxtda hansı işi görəcəklərini dəqiqləşdirməlidirlər. Amma vaxtın necə keçməsindən xəbərsiz qalmağı xoşlayanlar şeytan tələsindən qorunmalıdırlar. Şeytan şadlanar ki, insan gecəni oyaq qalıb əxlaqsız filmlərdən, boş-boş söhbətlərdən .feyziyab olsun

Fərdi ibadət üçün əlverişli olan gecədən fərqli olaraq gündüz ictimai işlər, təhsil, tədris və s. işlər üçün daha uyğundur. Cəmiyyətin ehtiyaclı olduğu hər hansı bir iş böyük ibadətdir. Həzrət Peyğəmbər (s) imam Əli (ə) və sair imamların gündəlik işlərindən biri insanlara yardım idi. Əgər gecə ibadətləri kimin üçün çətindirsə də heç olmasa gündüz .ehtiyaclılara kömək əli uzadaq

## ŞEYTANIN İKİ TƏLƏSİ

Mö'minlərə, xüsusi ilə də Əhli-beyt dostlarına yardımçı olmaq dini vəzifəmizdir. İmam Sadiq (ə) buyurur: «Ey Cündəb oğlu, insanları ovlamaq üçün şeytanın tələləri vardır. Ən böyük tələlərdən biri insanı öz din qardaşlarına yardımdan məhrum etməkdir. Şeytanın



---

.İnsan» surəsi, ayə ۲۶» [۴۰] -۱

.İsra» surəsi, ۷۹» [۴۱] -۲

.ikinci tələsi isə insanları namazı vaxtında qılmaqdan çəkindirməkdir

Vacib dini vəzifələrinə əməl edən insan bə’zən işini bitmiş hesab edir. Hansı ki, din qardaşlarının ehtiyacını ödəmək böyük dini vəzifədir. Təhsil, tədris, jurnalistika və s. sahələrdə çalışanlar qohum-əqrabanı, qonşuları, din qardaşlarını unutmamalıdırlar. Diqqətini bir sahəyə yönəldib digər sahələri nəzərdən qaçırmaq düzgün deyil. Bu diqqətsizliyin bünövrəsini qoyan şeytan qulağımıza pıçıldayır ki, axı sənin nəyin var ki, başqalarına kömək edəsən. Axı başqalarından sənə nə var. İmam Sadiq (ə) sözünü davam edərək buyurur ki, din qardaşına kömək etməkdən böyük ibadət yoxdur, hətta .ehtiyaclarını ödəyə bilməsən belə, Allah xatirinə onlarla görüşmək böyük ibadətdir

Şeytanın ikinci tələsi namazın əvvəl vaxtını sovuşdurmaqdır. Namaz insanı birbaşa Allahla yaxınlığa aparır. Allahla bəndə arasında birbaşa rabitə namazdır. Namazın vaxtında və diqqətlə qılınmamasının əsas səbəblərindən biri çox yatmaq, gec yatmaq və pis yatmaqdır. Namazı vaxtında qılmayan insan başqa dini vəzifələrinə e’tinasızlıq göstərərək yavaş-yavaş dinə məsxərə gözü ilə baxmağa başlayır. «Allahın ayələrini .(yalan hesab edib məsxərəyə qoyanların aqibəti pis oldu»(١

Dini vəzifələrə e’tinasızlığın əsas səbəblərindən biri insanın azğın və dünyagir mühitə düşməsidir. Allah buyuruqlarının xatırlanmadığı mühitdəki dünya söhbətləri insan mə’nəviyyatını süquta yetirir. «Allah ilə əhdlərini ucuz qiymətə satan şəxslərə axirət



---

.Rum» surəsi, ayə ١٠» [٤٢] -١

ne’mətlərindən pay yoxdur. Allah qiyamət günü onları dindirməz, onlara nəzər salmaz...»(۱).

Ey Rəbbimiz, bizi vəzifələrimizlə tanış et və şeytanın şərindən amanda saxla!



---

۱- [۴۳] «Ali-imran» surəsi, ayə ۷۷.

İmam Sadiq (ə) İbn Cündəbə buyurur ki, mö’min yalnız ilahi əzabdan qurtulmaq üçün düşünüb cəhd edə, qəmlənə bilər. Əbədi əzabdan qurtuluş fikrindən yaranan cəhd, qüssə faydalıdır. Bütün şüurlu varlıqlar fitrətən əzab-əziyyətdən uzaq olmağa meyilli yaradılmışlar. Demək, bu varlıqların fəaliyyətində mənfəətə qarşı maraq və zərərdən uzaqlaşmaq xüsusiyyətləri vardır. Digər bir tərəfdən ağrı-acı içində olan insan nə qədər ki rahatlaşmayıb heç bir ləzzət haqqında düşünmür. Məsələn, dişi ağrıyan adam .yalnız canını bu ağrıdan qurtarmaq barədə düşünür və çalışır

Sual: İnsan gələcəkdə qarşılaşacağı çətinliklərdən qurtulmaq üçün eyni cür sə’y göstərirmi? Tutaq ki, insanı müəyyən bir şəhərdə xeyli qazanc gözləyir. Amma həmin şəhərdə yolxucu bir xəstəlik yayılıb. Bu insan qazanca çatmaq üçün xəstəliyə ?yoluxmağa razıdırmı

Onun seçimi təhlükəyə nə dərəcədə inanmasından asılıdır. Əgər insan təhlükəyə .düşəcəyinə əmindirsə, özünü qorumaq üçün qazancdan keçir

Diqqət: Qarşıya çıxacaq təhlükədən qurtulmaq üçün çarə axtarışı ərəb dilində «həmm» adlanır. Bu halı keçirən şəxsə isə «məhmum» deyirlər. «Mühüm», «əhəmiyyət» sözləri də həmin kökdəndir. Gələcəkdə hansısa çətinliklərlə üzləşəcəyini ehtimal edərək, insan bu çətinlikləri aradan qaldırmaq üçün cəhd edir. Bu cəhd, himmət «həmm»dir. «Həmm» .sözünün lüğəti mə’nası isə «cəhd», «qəm», «qüssə», «kədər»dir

## (İNAM VƏ CƏHD (QÜSSƏ

Cəhənnəm və onun əzabına inanan insan buna biganə qala bilərmi? Bu həqiqətlərə qəlbən inanan insan ticarət, əyləncə haqqında düşünə bilərmi? İnsanın qarşıdakı .çətinliklərə münasibəti onun inam dərəcəsindən asılıdır

Bu mövzuda məşhur bir hədis vardır: Bir gün həzrət Peyğəmbər (s) məsciddə rəngi qaçmış, gözləri çuxura düşmüş bir cavan görür. Həzrət (s) onun halını soruşduqda cavan cavab verir ki, yəqin halındayam. Peyğəmbər (s) «sənin yəqininin əlamətləri nədir?»-deyə soruşduqda cavan belə ərz edir: «Dünən gecə sübhədək axirət əzabının qorxusundan gözümə yuxu getməyib. Ona görə də rəngim saralıb». Həzrət Peyğəmbər (s) ona dua etdi(١). Bəli, dərin inam insanda belə bir hal yaradır və o, başqa heç nə haqqında düşünə bilmir. Amma böyük əksəriyyət axirət haqqında belə dərin düşüncə .tərzindən uzaqdır

Mə'sumlardan (ə) başqa hamı az-çox günahkardır. Məhz bu günahlara görə nəzərdə tutulmuş əzablar haqqında düşünmək lazım gəlir. Amma dünya qayğılarına başı qarışmış insan qarşıda onu gözləyən təhlükəyə e'tinasızlıq göstərir. Hansı ki, insan eşitdiyi ayə və hədislər haqqında düşünsə öz aqibətindən narahat olub tədbir görər. Yüksək inamı, yəqinliyi olanlar daim axirət haqqında düşünürlər. Amma böyük əksəriyyət iman zəifliyi ucbatından var-dövlət, vəzifə, rahatlıq ardınca qaçıb yaranışın .əsl məqsədindən uzaq düşür

Bəli, insanların iman mərtəbələri fərqlidir. Aramızda az da olsa, axirət əzabı haqqında eşidərkən göz yaşı



---

.Biharul-ənvar», cild ٧٠» [۴۴] -١

axıdanlar var. Çoxları isə, hətta qiyamət sorğusu haqqında moizə gedişində öz ticarəti, .dünya problemləri haqqında düşünür

## AĞIL VƏ GƏLƏCƏYƏ BAXIŞ

Ağıl insanı qarşıdakı çətinlikləri aradan qaldırmağa çağırır. Adi məişət problemlərinin həllinə xeyli vaxt ayırıb əbədi həyat səadətinin tə’mini üçün tədbir görməmək ağıla uyğun deyil. Dünya ləzzətləri ardınca qaçan insan qarşıdakı müdhiş təhlükənin nə .qədər əhəmiyyətli olduğunu anlamır

Rəvayətdə deyilir ki, boynum zəncirlənib azad olmaq istəyirəm. Amma boynumdakı .ağır yük imkan vermir; nəzarətçilər məni bədbəxtliyə sürükləyir

Bəli, batdığımız günahlar boynumuzda yük olub. Bu yükdən azad olmağa çalışmayanın cəhdi, qəm-qüssəsi yanlış istiqamətə yönəlib. Hədis: «Sübh əzabdan qurtulmaq fikri ilə oyanmayan şəxs mühüm bir məsələni yüngül sayıb. Böyük bilməli olduğunu kiçik bilib. .«Allahdan kiçik bir xeyir istəyib

Əbədi əzab haqqında düşünməyən insan şübhəsiz ki, dünya işlərini çək-çevir edəcək. .Əbədi əzaba diqqət yönəltməyən kəs qurtuluş üçün tədbir də tökəsi deyil

Ağıl tələb edir ki, insan axirətə inandığı qədər çalışmalıdır. Çünki dünya çətinlikləri axirət çətinlikləri ilə müqayisədə çox əhəmiyyətsizdir. Axirət əzabını düşünən insana dünya ağrıları çox asan gəlir. Əlbəttə ki, imanı güclü olan bəndələr bu işdə daha çox .sə’y göstərərlər

## MÖʼMİNLƏR QARŞISINDA VƏZİFƏLƏRİMİZ

İnsan ictimai varlıqdır və onun din qardaşları qarşısında müəyyən vəzifələri vardır. Möʼminlərin istəyini yerinə yetirmək, onlara qarşı xeyirxah, vəfalı və səmimi olmaq bir borcdur. Necə ola bilər ki, müsəlman müsəlmanı aldada, ona xəyanət edə, ona zərər vura?! Bir insanı aldadıb alçaltmaq qərarı onunla döyüşə bərabərdir. Ticarətdə müsəlman qardaşını aldatmaq onunla vuruşmaqdır. Müsəlmanla vuruşmağın digər bir forması onu, tutduğu məqamdan endirib yerində oturmaqdır. Belə xəyanətkar .insanların yeri cəhənnəmdir

## HƏSƏDİN FƏRDİ VƏ İCTİMAİ ZƏRƏRLƏRİ

Hədisdə buyurulur: «Möʼmin qardaşına həsəd aparanın imanı puç olar, necə ki, duz suda həll olur». Təəssüf ki, əksər insanlarda az-çox bu çirkin sifət müşahidə edilir. Xüsusi ilə uşaq yaşlarında insan özündə olmayanı başqalarında görəndə həsəd aparır. Əgər insan bu çirkin sifətlə mübarizə aparmasa qəlbində kök atıb onu cəhənnəmə sürükləyə bilər. İmanlı insan başqalarına verilmiş gözəllik, isteʼdad kimi təbii neʼmətlərə həsəd apara bilərmi? «Nə üçün filankəs məndən gözəldir, filankəs məndən bacarıqlıdır» demək möʼminə yaraşan iş deyil. Həsədin əsl məʼnası budur ki, nə üçün .Allah məni məhrum edib? Bu isə Allahın məsləhətinə eʼtirazdır

Həsədcil insan Allahın işlərinə müdaxilə edir. Əgər bir insan zəhmət çəkib var-dövlət qazanır və Allah buna yol verirsə, bu işdə yalnız Allaha məʼlum olan səbəblər vardır. Allahın bütün işlərində hikmət vardır. Əgər hikmət Allahın sifətidirsə, imanlı insan Allahın işinə

hansı əsasla e'tiraz edə bilər. Belə bir e'tiraz Allahın hikmətini qəbul etməməkdir. .Həsəddə ifrata varan insan hətta müşrik səviyyəsinə alçala bilər

Həsəd hissini öz başına buraxmağın olduqca pis nəticələri vardır. Başqalarının malik olduğu maddi və mə'nəvi ne'mətləri görərkən qəlbində həsəd hiss edən insan tə'cili bir çarə qılmalıdır. Düşünməlidir ki, əksər ne'mətlər insan üçün bir sınaqdır. Bu gün Allahdan ne'mət istəyib onu alan adam qiyamət günü öz istəyinə peşman ola bilər. Axı .varlının, iste'dadlının Allah qarşısında vəzifələri daha ağırdır

Unutmaq olmaz ki, iblisin küfrünün kökü həsəd idi. Bəşər tarixində müşahidə etdiyimiz qanlı müharibələrin çoxu həsəddən törənib. Bir nəfərin həsədi ucbatından minlərlə insan həyatını əldən verir. Bütün həyatını İslama sərf edib, sonradan məhz həsəd səbəbindən imamla üz-üzə dayananlar olub. Ona görə də həsədin ilk işartısı ilə .mübarizə aparmaq, onun kök atmasına yol verməmək lazımdır

!Ya Rəbb, bizi həsədin yandırıcı odundan qoru

Həqiqi əhli-beyt (ə) ardıcıllarının mükafatı

İmam Sadiq (ə) buyurur: «Mö’min qardaşının arzusunu yerinə yetirmək üçün qədəm götürən insan Səfa və Mərvə arasında sə’y (həcc əməllərindən biri) etmiş kimidir. Şəxsən din qardaşının ehtiyacını ödəyən kəs Allah yolunda Bədr və Ühüd döyüşündə cihad edib qanına boyanan şəxs kimidir». Bu mövzu ilə başqa rəvayətlərdə də rastlaşırıq. Bu rəvayətlərdə zahirən kiçik əməllərə görə çox böyük savablar və’d olunur. Əlbəttə ki, bu rəvayətlərdən sui-istifadə oluna bilər. Bə’ziləri rəvayətin mö’təbər olmadığını, bir başqaları hər kiçik işə böyük savab veriləcəyini iddia edə .bilərlər. Bu fikirlərdən biri ifrat, digəri isə təfritdir

Zahirən əhəmiyyətsiz görünən bə’zi ibadətlər böyük savaba malik ola bilər. Savab kəmiyyətdən yox, səbəbdən, niyyətdən, ixlasdan, səmimiyyətdən daha çox asılıdır. Məsələn, din qardaşına xidmət elə şəkildə ola bilər ki, bu işi görən şəhidin savabını əldə edər. Yə’ni niyyət və səmimiyyətdən çox şey asılıdır. Milyonçu ehtiyaclıya yüz manat verməklə çətin ki, şəhadət savabını qazana bilər. Amma özü və ailəsi ehtiyaclı ikən din .qardaşına yardım edən həmin savaba nail ola bilər

Din tələbələri arasında bə’zilərinə əfsanə görünə biləcək bir qayda var. Ehtiyac içində yaşayan tələbə öz din qardaşının müşkülünü aradan qaldırmaq üçün tərəddüd etmədən təqaüdündən keçir. Əlbəttə ki, gecəni ac qalmaq hesabına mö’minin .ehtiyacını ödəməyin dəyəri böyükdür

İslam dinində ehtiyaclı olduğun şeyi başqasına vermək «isar» adlanır. İsar olduqca böyük bir savaba malik əməldir. «Həşr» surəsinin ۹-cu ayəsində oxuyuruq: «Mühacirlərdən əvvəl yurd salmış və iman gətirmiş kimsələr öz yanlarına mühacirət edənləri sevər, onlara qənimət verildiyinə görə həsəd duymaz, ehtiyacları olduqları halda onları özlərindən üstün tutarlar». Ehtiyaclı olduğunu başqasına vermək fədakarlıq tələb edir. Mö'minin istəyini yerinə yetirmək isə fədakarlıqsız ötüşmür. Bu fədakarlıqları dəqiq qiymətləndirmək mümkün olsaydı mə'lum olardı ki, mö'minin istəyini xalis niyyətlə yerinə yetirənlərə nə üçün şəhid savabı verilir. «Mallarını Allah yolunda sərf edənlərin halı yeddi sünbül verən bir toxuma bənzər ki, bu sünbüllərin hər birində yüz ədəd dən var. Allah istədiyi şəxs üçün bunu qat-qat artırır»(۱).

İmam Riza (ə) buyurur: «La ilahə illəllah kəlməsi» insanı əzabdan qurtarmaq gücünə malikdir. Amma müəyyən şərtlər daxilində»(۲). Bəli, müəyyən şərtlər daxilində «La ilahə illəllah» nicatvericidir. Bu şərtlərdən biri Əhli-beyt vilayətini qəbul etməkdir. Əslində hər bir işin nəticə verməsi üçün şərait lazımdır. Od yandırıcı olsa da bu iş yalnız oksigen olan mühitdə baş tutur.

## DİN QARDAŞLARINA E'TİNASIZLIQ

İmam Sadiq (ə) buyurur: «Qədim qövmlərdən bir çoxu ilahi əzaba düçar oldular. Amma fəqirlərin haqqına riayət etsəydilər bu əzabdan amanda qalardılar». Cəmiyyətdə imkanlı şəxslər fəqirlərin ehtiyacını ödəməlidirlər. Bu



---

۱- _ftnref۴۵

۲- [۴۶] «Biharul-ənvar», cild ۴۹.

haqqı ödəməməklə günaha batanlar əzaba düçar olur. Fir’on insanları özünə səcdəyə vadar edən zalım bir padşah idi. Amma bir çox fəqirlər onun süfrəsindən faydalandığı .üçün Allah Fir’onun cəzasını tə’xirə salır

Deməк, mö’min qardaşının hüququna riayət etməyənləri dünya və axirət əzabı gözləyir. Əgər cəmiyyətdə fəqirlərin hüququna riayət olunmazsa, bu cəmiyyəti sel, zəlzələ kimi ictimai fəlakətlər gözləyir. Öz xoşbəxtliyini başqalarının bədbəxtliyi .üzərində quran istismarçı sərmayədarların cəzası yalnız cəhənnəm əzabıdır

## İLAHİ VƏDLƏRİN HƏYATA KEÇMƏ ŞƏRAİTİ

İmam Sadiq (ə) öz ardıcıllarına xəbərdarlıq edir ki, şeytan ilahi və’dələrin gerçəkləşmə şəraitindən nəzərinizi yayındırmaqla sizi aldada bilər. Tarixdə insanların ilahi və’dələrdən düzgün faydalanmaması faktı çoxdur. Məsələn, Bəni-İsrail Fir’on tərəfdarlarının caynağında olarkən Allah onlara və’d edir ki, iman gətirsəniz xilas olacaqsınız. «Bəqərə» surəsinin ۴۷-ci ayəsində buyurulur: «Ey İsrail övladı, sizə bəxş etdiyim ne’mətlərimi və sizi aləmdə xəlq olunmuşlardan üstün tutduğumu yadınıza salın». Bəni-İsrail bu ayədən belə nəticə çıxarmışdı ki, daha onlar üçün axirət əzabı olmayacaq. Uyğun surənin ۸۰-cı ayəsində Allah-təala buyurur: «Siz Allahdan belə bir və’d almısınızmı?!». «Maidə» surəsinin ۱۸-ci ayəsində isə belə buyurulur: «Yəhudilər və xaçpərəstlər deyir ki, biz Allahın oğulları və sevimliləriyik. Onlardan soruş ki, bəs nə üçün Allah günahlarınıza görə sizə əzab verir?» Bu gün də yəhudilər özlərini digər millətlərdən

üstün bilib onlara ağalıq etmək üçün plan çızırlar. Mə’sum imamların dövründə də «murciə» adlanan tayfa əzabdan qurtulmaq üçün iman gətirməyi kifayət hesab edirdilər. Təəssüf ki, Əhli-beyt (ə) ardıcılları arasında da belə yanlış qənaətə gələnlər də var. Bə’ziləri elə düşünür ki, cəhənnəm əzabından qurtarmaq üçün Əhli-beyti sevmək kifayətdir. Hətta imam Baqir (ə) və imam Sadiqin (ə) dövründə də belələri olub. Hansı ki, imam Baqir (ə) buyurmuşdur: «İlahi göstərişlərə əməl edənlər bizim dostumuz, etməyənlər isə düşmənlərimizdir!»(١).

İnsanları Əhli-beyt məhəbbətinə də’vət etməkdə məqsəd günah qorxusunu qəlblərdən çıxarmaq deyil. Əgər Əhli-beyt yolu Allaha yaxınlaşma yoludursa, necə ola bilər ki, Əhli-beyti sevən insan günaha bata?! İmam Baqirin (ə) buyuruğundan belə nəticə çıxarmaq olar ki, Əhli-beyt məhəbbəti insanın əməl və rəftarından hiss olunmalıdır. Bir sözlə «sevirəm» demək kifayət deyil.

İmam Sadiq (ə) İbn Cündəbə buyurur: «Bütün şiələrə çatdır ki, məqsədsiz vurnuxub yolu itirməsinlər. Günahdan çəkinib, vəzifələrə ciddi əməl etmədən bizim vilayətə yetişmək olmaz. Vilayətə yetişməyin digər şərti mö’min qardaşının ehtiyacını aradan qaldırmaqdır». İnsan öz səadəti üçün çalışdığı kimi mö’min qardaşının səadəti üçün də çalışmalıdır. Eləcə də, başqalarına zülm edən Əhli-beyt şiəsi ola bilməz. Əhli-beytə məhəbbətin izharı, onlar haqqında şe’r oxuyub əzadarlıq etmək, vilayət əhli olmaq üçün azdır. Sözsüz ki, bir damla Əhli-beyt məhəbbəti də qənimətdir. Amma həqiqi şiəlik üçün təkcə məhəbbət kifayət deyil.



---

١- [٤٧] «Biharul-ənvar», cild ٧٠.

İmam Sadiqin (ə) nəzərində şiə

Həqiqi şiənin özünəməxsus xüsusiyyətləri var və onlar bu xüsusiyyətlərlə tanınırlar. Əhli-beyti sevmək şiə olmaq üçün kifayət deyil. Həqiqi şiə olmaq üçün danışıq, rəftar, ibadət və sair sahələrdə mə'sum imamların yolunu getmək zəruridir. «Şiə» sözü Qur'anda da işlədilmişdir. Həzrət Nuhun əhvalatından sonra buyurulur: «Şübhəsiz ki, İbrahim də onun yolu ilə gedənlərdən (onun şiələrindən) idi»(١).

Əhli-beyti sevmək həqiqi şiə olmaq deyil. Məsələyə aydınlıq gətirmək üçün rəvayətə müraciət edək. İmam Rizanın (ə) vəliəhdlik məsələsi ortaya çıxdığı zaman o həzrəti Mərv şəhərinə gətirdilər. Camaat dəstə-dəstə onun təbrikinə gəlirdi. Camaat elə hesab edirdi ki, bu iş Əhli-beytin qələbəsidir. Bir müddət sonra imamın görüşünə gəlmiş şiələri gözətçi qapıda saxlayıb soruşdu ki, siz kimsiniz? Onlar cavab verdilər ki, biz imamın şiələriyik. Gözətçi imamdan icazə almaq üçün getdi. O, imama ərz etdi ki, gələnlər sizin şiəniz olduqlarını deyirlər. İmam Riza (ə) onları qəbul etmədi. Bu adamlar üç gün ardıcıl imamın görüşünə gəlsələr də, imam görüşdən imtina etdi. Onlar anladılar ki, imamın imtinasında bir mə'na var. Gözətçiyə yalvardılar ki, bu işin səbəbini öyrənsin. Gözətçi imamdan soruşdu ki, ey mənim mövlam, bu insanları qəbul etməməyinizin səbəbi nədir? İmam buyurdu: «Onlar şiə olduqlarını iddia



---

١- [٤٨] «Saffat» surəsi, ayə ٨٣.

edirlər. Həqiqi şiələr Səlman və Əbuzər kimi olur. Bu insanlarda isə həqiqi şiə əlaməti yoxdur. Onlara de ki, onlar həqiqi şiə yox, sadəcə, Əhli-beyti sevənlərdir». Bu insanlar aşiq idilər. Ona görə də işin səbəbini öyrəndilər. Hansı ki, şiəlik iddiasında olanların çoxu həvəsdən düşüb geri qayıdardı. Qəlbində Əhli-beyt məhəbbəti olanlar bu .məhəbbətdən istifadə edib həqiqi şiə olmaq üçün çalışırlar

## ŞİƏLİYİN NİŞANƏLƏRİ

.İman qardaşlarına qarşı əliaçıqlıq .١

İmam Sadiq (ə) zikr olunmuş rəvayətdə əliaçıqlıq və bəxşişi şiələrə layiq birinci sifət kimi tanıtdırır. İnsan öz ailə üzvlərinə diqqətli olduğu kimi din qardaşlarına da diqqətli olmalıdır. İmkanlı müsəlman imkansız müsəlmanın ehtiyaclarını ödəməyə borcludur. Mö’min qardaşı xəstələnərkən və ya səfərdən qayıdarkən onun görüşünə getmək şiənin ibtidai vəzifələrindəndir. Əlbəttə ki, bütün əxlaqi göstərişlərə əməl etmək çətindir. Məsələn, evdə ehtiyac olmayan əşyaları, kitabları satıb dostun ehtiyaclarına .sərf etmək o qədər də asan deyil

.Əlli bir rək’ət namaz .٢

Şiələr öz ibadətləri ilə də seçilirlər. Əhli-beyt Allaha yaxın olduğu üçün seçilir. Onlar ibadət və bəndəlikdə hamıdan irəlidə olduqlarından, özünü şiə bilənlər də ibadətləri ilə seçilməlidirlər. Şiələrə əlli bir rək’ət namaz qılmaq sifariş olunmuşdur. Bu əlli bir .rək’ətin on yeddi rək’ətini gündəlik vacib namazlar təşkil edir

.Davakar olmamaq .٣

Millətlər arasında hər çirkin sifəti müəyyən bir heyvana aid bilmək kimi adət var. Məsələn, heyvanlar arasında it yeri gəldi-gəlmədi hücum etməsi, davakarlığı

ilə seçilir. Tanımadığı adamı görən it hökmən ona hücum edir. Onun bu hərəkəti xarakterindəki davakarlığın

nişanəsidir. Müəyyən obyektləri qorumaq üçün hətta itlərə keşikçilik tə'limi də keçirilir. Beləcə, itdə olan davakarlıq xüsusiyyətindən faydalı şəkildə istifadə edilir. Amma insanın tanımadığı insana qarşı davakar münasibəti normal sayıla bilməz. Amma tanışlara qarşı davakarlıq heç itdə də müşahidə olunmur. İmam Sadiq (ə) buyurur: .««Bizim şiələr it kimi davakar olmazlar

.Tamahkarlıq .۴

Tamahkarlıq ən çox qarğada müşahidə olunan sifətdir. Bu quş ac olmadığı vaxtda da əlinə keçəni toplayıb gələcək üçün ehtiyat yığır. Qarğa qoz yığıb basdırması ilə məşhurdur. Hətta belə bir mə'lumat var ki, təbiətdəki qoz ağacının əksəriyyətini qarğalar əkib. İmam Sadiq (ə) buyurur: «Bizim şiələr qarğa kimi tamahkar olmaz». Yə'ni Əhli-beyt ardıcıllarında ehtiyacından artıq var-dövlət toplamaq həvəsi müşahidə .edilməməlidir. Əhli-beyt (ə) öz şiələrini heyvani sifətlərdən uzaq olmağa çağırır

.Əhli-beyt düşmənləri qarşısında vüqar və onlardan uzaqlıq .۵

İslamın tə'kid etdiyi bəyənilmiş sifətlərdən biri izzəti-nəfs, yə'ni ehtiyacını bildirməyib vüqarlı dayanmaqdır. İnsan imkan daxilində başqalarına, hətta ata-anasına da ağız açmamalıdır. Əlbəttə ki, insan bə'zən başqalarının köməyinə ehtiyac duya bilər. Məsələn, gecə yarı ağrısı tutmuş ailə üzvünü xəstəxanaya aparmaq üçün qonşunun avtomobilinə ehtiyac yarana bilər. Amma bu günkü dünyada başqalarının köməyi olmadan yaşamaq olduqca çətindir. Bəs kimdən kömək istəmək olar? İmam Sadiq (ə) buyurur: «Bizim şiələr bizim düşmənlərimizlə

qonşu olmaz, acından ölsələr belə bizim düşmənlərə ağız açmazlar». Əhli-beytin əxlaqi göstərişlərində tapşırılır ki, imkan daxilində mö'minlərdən və Əhli-beyt şiələrindən kömək istəyin və günahkarlardan, Əhli-beyt düşmənlərindən minnət götürməyin. Hədisdə cahillər yox, inadkar düşmənlər nəzərdə tutulub. Nadanların hidayət olmasına ümid itmədiyindən onlarla əlaqə saxlamaq faydalı ola bilər. Bə'ziləri isə inadkarcasına düşmənçilik edirlər. Qeyrətli şiə belələrinə ehtiyacını bildirməməli, onlara ağız açmamalıdır.

۶. Bütün hökmlərdə Əhli-beytə tabeçilik.

Bə'zi hökmlərə münasibətdə məzhəblərin nəzəri fərqlidir. Məsələn, Əhli-beyt ilanbalığının ovunu haram bildiyi halda, digər məzhəblər onun ovunu və yeyilməsini halal hesab edirlər. Məsələn, başqa məzhəblərdə xüsusi hallarda dəstəmaz zamanı ayaqqabının üstündən məsh çəkməyi mümkün hesab etdiyi halda, Əhli-beyt bu işə icazə vermir. İslamın ilkin dövrlərində ərəblər xurma və kişmişi isladar, bir müddət sonra onun suyunu içərdilər. Bu suda zəif məstedicilik xüsusiyyəti olardı. Əhli-beyt bu içkini spirtli içkilərə aid edərək haram buyurmuşdur. İmam Sadiq (ə) buyurur: «Bizim şiələr ilanbalığı yeməkdən imtina edər, ayaqqabı üstündən məsh çəkməz, zöhr namazı və onun nafiləsini düzgün yerinə yetirər və spirtli içkidən istifadə etməzlər».

## HƏQİQİ ŞİƏLƏRİN AZLIĞI

İmam Sadiq (ə) həqiqi şiələrin xüsusiyyətlərini saydıqdan sonra İbn Cündəb onların harada olmağı barədə soruşdu. İmam (ə) bir Qur'an ayəsinə işarə ilə

.həqiqi şiələrin dağlarda və şəhərlər ətrafında olduğunu bəyan edir

Bu söhbət o dövrə təsadüf edir ki, mövcud hakimiyyət Əhli-beyt və onun şiələrini incidib sıxıntıya salardı. Şiələr həbs olunar, min bir işgəncə ilə qətlə yetirilərdilər. Ona görə də əksər şiələr Hicazdan uzaqlaşar, İran və sair məntəqələrə köçərdilər. Elə bu səbəbdən də bir çox imam övladlarının məqbərəsi İranın dağlıq ərazilərindədir. Elə bu səbəbdən də İmam (ə) İbn Cündəbə anladır ki, bizim şiələri şəhər mərkəzlərində camaat arasında görə bilməzsən. İmam buyurur ki, bizim şiələri tanımaq istəsən adi insanlarla yaxınlıq etməyənləri axtar. Həzrət buyurur ki, bizim şiələr xalq arasında .eynən Həbib Nəccar Antakiyada olduğu vəziyyətdədir

Allah-təala «Yasin» surəsinin ۱۴-cü ayəsində iman gətirməyənlərə antakiyalıları misal çəkir: «O zaman onlara iki elçi göndərmişdik, amma onlar ikisini də təkzib etmişdilər. O iki elçini üçüncüsü ilə qüvvətləndirdik. Onlar dedilər ki, həqiqətən biz sizə göndərilmiş elçilərik». Amma şəhər camaatı nəinki iman gətirmədilər, hətta göndərilmiş peyğəmbərləri ölümlə hədələdilər. Bu vaxt peyğəmbərləri müdafiə etmək üçün şəhərin ucqar nöqtəsindən Həbib Nəccar gəldi: «Şəhərin ən ucqar tərəfindən bir kişi çaparaq gəlib dedi: «Ey qövmüm, elçilərə tabe olun!»(۱). Həbib Nəccar şəhərin bir guşəsində tənha yaşayırdı. Qövmünü doğru yola də'vət etdikdən sonra hücuma .mə'ruz qalıb qətlə yetirildi



---

.Yasin» surəsi, ayə ۲۰ » [۴۹] -۱

Maraqlıdır ki, imamın yuxarıdakı buyuruqları hansı şəraitə uyğundur? Mə’sum imamların buyuruqlarını anlamaq üçün diqqət və ali dini anlayışa (ictihada) ehtiyac vardır. Rəvayəti oxuyub onun zahiri mə’nasına əməl etmək düzgün deyil. Bə’ziləri rəvayətin zahiri mə’nası xoşa gəldiyi üçün ona istinad edirlər. Məsələn, onlar bir rəvayət oxumaqla belə qənaətə gəlirlər ki, əsl şiə xalqdan uzaqlaşıb fərdi ibadətə məşğul olmalıdır. Guya şiə o şəxsdir ki, çölə-bayıra çox çıxmasın, çıxanda da əbasını başına çəkib kimsə ilə kəlmə kəsməsin. Söz yox ki, son dövrlər mö’minlərdə ictimai fəallıq müşahidə edilir. Unutmaq olmaz ki, hansısa müstəhəb, əxlaqi bir göstəriş vacib vəzifənin qarşısını ala bilməz. Xüsusi şəraitə malik olan əxlaqi göstərişlər heç vəchlə vacib ictimai vəzifələri öhdədən götürmür. Dərviş təxəyyüllü bə’zi insanlar bir rəvayət eşitməklə cəmiyyətdən uzaqlaşıb ünsiyyətdən qaçırlar. Bəs İslamdakı ictimai vəzifələr kimə aiddir və bu vəzifələrə nə vaxt əməl olunmalıdır?!

Amma başqa bir qrup müsəlman ictimai vəzifələrə maraq göstərib ibadət və özünütərbiyə məsələlərini ikinci plana keçirirlər. Onlar elə düşünürlər ki, ictimai fəaliyyətlə məşğul olan insanın müstəhəb ibadətlərə ehtiyacı yoxdur və ibadət qocaların, imkansızların işidir. Guya Qur’an oxuyan, dua və zikrə məşğul olanlar başqa bir iş bacarmadıqlarından ibadət edirlər. İctimai iş bəhanəsi ilə ibadətdən uzaqlaşmaq böyük səhvdir. İbadət və özünütərbiyəyə hamı ehtiyaclıdır. Əlbəttə ki, şərait və ehtiyaclar müxtəlifdir, amma ictimai iş ibadəti əvəz edə bilməz. İctimai işdə məqsəd Allahla yaxınlıqdır. İbadətə

diqqətsiz insanın ictimai fəaliyyətinin mahiyyəti də dəyişir. Əgər həm ibadət, həm də ictimai işdə məqsəd Allaha yaxınlaşmaqdırsa, nə üçün bu işlərdən yalnız birinə üstünlük verilməlidir?! Cəmiyyətə xidmət etmək savab olsa da Qur’an oxumağın da öz savabı vardır. Vacib ictimai vəzifənin savabı Qur’an oxumağın savabından çox olsa da, ibadətə olan ehtiyac ödənməz. Mö’minlik ruhunu daim qorumaq üçün müstəhəb ibadətlərin faydası müstəsnadır. İbadətdən uzaqlaşmış insan ictimai işlərdə əsl .məqsəddən uzaq düşüb yolunu aza da bilər

## ŞİƏLİK ŞƏXSİYYƏTİNİN QORUNMASI

Şiələrin cəmiyyətdən uzaq olmaları haqqındakı rəvayət hamıya aid edilə bilməz. Məsələn, şiə böyüklərindən olmuş Əli ibn Yəqtin imam Kazimin (ə) göstərişi ilə Harun Ərrəşidin vəziri olmağa razılıq vermişdir. O, öz imanını qorumaqla yanaşı şiələrə də kömək edirdi. Bir şəxs günahkar mühitdə imanını qorumaq qüdrətinə malikdirsə bu mühitdə iştirak etməli və başqalarının hidayəti üçün çalışmalıdır. Başqalarının hidayəti vəzifəsi hamı üçün hər zaman vacibdir. Amma zəif imanlı insan günahkar cəmiyyətdə əriyib imanını itirməkdən qorxursa tə’cili olaraq bu cəmiyyətdən uzaqlaşmalıdır. Eləcə də dini agahlığı və elmi səviyyəsi aşağı olan insanlar hər yerdə hər adamla mübahisəyə girişməməlidirlər. Günahkar cəmiyyətdə yaşayan bir qrup mö’min öz şiə .şəxsiyyətini qorumalı və bir-birləri ilə əlaqəni möhkəmləndirməlidirlər

Bir çox qeyri-müsəlman ölkələrdə şiələrin öz dini şəxsiyyətlərini qoruduqları göz qabağındadır. Onlar bir-birləri ilə get-gəl edərək dini vəzifələrinə əməl edirlər. Yalnız bazarlıq və digər vacib işlər üçün cəmiyyətə

çıxırlar. Məsələn, Keniyada dini vəzifələrinə əməl edən, hətta rəcəb və şə’ban aylarını müstəhəbb oruc tutan müsəlman gənclər vardır. Afrikanın ortasında məsihi bir ölkədə belə gənclər ciddi qorunduqları üçün günahkar cəmiyyətdə əriməmişlər. Hansı ki, bə’zi müsəlman ölkələrində bu gün rastlaşdığımız şiələrin, hətta müsəlman olduğu şübhə doğurur. Belələri günahkar cəmiyyətdə əriyərək öz şiəlik şəxsiyyətini itirmişlər. Onların şiəliyi yalnız imam Hüseyn (ə) adını bilməkdən ibarətdir. İmam Sadiq (ə) öz şiələrinə şəxsiyyətlərini qorumağı tapşıranda belə bir şəraiti nəzərdə tuturdu. Xüsusi ilə zəif .imanlı insanlar belə cəmiyyətlərdə əriyərək dini şəxsiyyətlərini əldən verə bilərlər

## Bağışlanmış günah və qəbul olmuş yaxşılıq

İmam Sadiq (ə) buyurur: «İman qardaşına cəfa etməkdən başqa hər bir günah bağışlanar». Qur'ani-Kərimdə isə belə buyurulur: «Şübhəsiz ki, Allah özünə şərik qoşanları əfv etməz. Bundan başqa istədiyi günahı bağışlar»(١). Ayədən göründüyü kimi şirk istisna olmaqla bütün günahlar bağışlana bilər. Əlbəttə ki, insan tövbə etmədən dünyadan müşrik gedərsə bağışlanmaz.

Bəs başqa günahlar necədir? İnsan dünya həyatında bu günahlara tövbə etməzsə bağışlana bilərmi? «Nisa» surəsinin ٣١-ci ayəsində kiçik günahlar haqqında buyurulur: «Əgər qadağan olunmuş böyük günahlardan çəkinsəniz, kiçik günahlarınızın üstünü örtər və sizi şərəfli mənzilə çatdırarıq». «Nəcm» surəsinin ٣٢-ci ayəsində oxuyuruq: «Kiçik günahlar istisna olmaqla böyük günahlardan çəkinib yaxşılıq edənlər bağışlanar».

Bəli, insan böyük günahlara yol verməyib kiçik günahlarda israr etməzsə, tövbə etməsə də kiçik günahları bağışlanar. Sözsüz ki insan tövbə etdiyi təqdirdə böyük günahlar da bağışlanar. Pis odur ki, insan dünyadan tövbə etməmiş gedə. İmam Sadiqin (ə) buyuruğunda nəzərdə tutulmuş günahın bağışlanmasına da ümid var. Sadəcə əzab və bağışlanma üçün can vermə, qəbr, bərzəx, qiyamət kimi mərhələlər vardır. Müxtəlif günahlar müxtəlif mərhələlərdə bağışlana bilər. O



---

١- [٥٠] «Nisa» surəsi, ayə ٤٨.

günahlara ki daha çox diqqət verilib, bunlar yüz illər əzabdan sonra bağışlanması .mümkün olan günahlardır

Din qardaşları ilə pis rəftar onların hüququnu pozmaq deməkdir. Xalqın hüququnu pozanlar isə yalnız xalqın razılığı ilə bağışlanıla bilər. İmam Sadiq (ə) xalqın razılığı şərt .olduğu üçün bu günahın bağışlanmayacağını bildirir

## RİYAKARLIQ YAXŞI ƏMƏLİ PUÇ EDİR

İmam (ə) buyurur: «Riya olmayan bütün yaxşı əməllər qəbul olunur». İnsanın gördüyü bütün işlər üçün iki hal mümkündür: iş görənin məqsədi ya Allahın razılığıdır, ya da hansısa şəxsi məqsəd. İnsan fəaliyyətində ən çox nəzərə çarpan qeyri-ilahi məqsəd özünügöstərmə və ya özününümayişdir. Yə'ni insan birinə kömək edərkən yardım göstərərkən özünü tanıtdırmaq istəyir. İslam dinində belə bir məqsəd «riya» adlanır. .İmam Sadiq (ə) buyurur ki, riyasız görülmüş iş Allah dərgahında qəbuldur

Əlbəttə ki, ilahi niyyətin də mərtəbələri vardır. İstənilən hər hansı bir mərtəbədə niyyət düzgündürsə, əməl də qəbuldur. Məsələn, vətənin müdafiəsinə qalxmış əsgərin niyyəti vətəni azad etməkdirsə, bu yaxşıdır. Amma əsgər ad-san qazanmaq, .müharibədən sonra bu addan istifadə etmək niyyətində də ola bilər. Bu isə çox pisdir

## HƏTTA MƏHƏBBƏTDƏ DƏ SAF NİYYƏT

Həzrət (ə) buyurur: «Ey Cündəb oğlu, dostluğun və düşmənçiliyin Allah xatirinə olsun». Yə'ni əməl və rəftarından əlavə qəlbinə aid olan sevgi və ikrahın da Allah üçün olsun. .Dostluq və düşmənçiliyinlə Allahın razılığını qazan

Bəli, bu olduqca çətin işdir. Amma insan elə bir kamillik mərtəbəsinə çatmalıdır ki, onun sevgisi və kini ilahi rəngə boyansın. İnsan istər dostluq, istərsə də düşmənçilik edərkən Allahı unutmamalıdır. Bu mərtəbəyə Allahın yardımı olmadan çatmaq qeyri-mümkündür. Çox az insanlar bu məqama nail olmuşlar. Amma bu o qədər uca .məqamdır ki, ona çatmaq üçün min bir əziyyətə qatlaşmağa dəyər

Məhəbbətin Allah xatirinə olması o demək deyil ki, insan Allahdan başqasını sevməməlidir. İnsan öz ata-anasını, ailə-övladını, vətənini sevə bilər və sevməlidir. Amma bütün bu sevgilər böyük bir məhəbbətin işığına möhtacdır və bu, ilahi məhəbbətdir. «İsra» surəsinin ٢٣-cü ayəsində buyurulur: «Rəbbin yalnız Ona ibadət etməyi və valideynlərə yaxşılığı buyurmuşdur». «Loğman» surəsinin ١۴-cü ayəsində isə belə buyurulur: «Biz insana ata-anasına yaxşılıq etməyi tapşırdıq». Ərlə arvad, dostla qohumlar arasındakı məhəbbət də insanı Allaha yaxınlaşdırmalıdır. İnsan Əhli-beyti də Allaha görə sevməlidir. Allah-təala Əhli-beyt sevgisinə işarə ilə buyurur: «(Ya Peyğəmbər) De ki, mən sizdən təbliğimin müqabilində qohumluq məhəbbətindən başqa bir şey istəmirəm»(١). Əgər Allah Əhli-beyti sevməsəydi, bəndələrin Əhli-beyti .sevməsinə ehtiyac qalmazdı

Mö'minin qəlbi Rəhmanın ərşidir» buyuruğu haqqında danışdığımız məhəbbətə nail» olmuş insanlara aiddir. Qəlbində min bir nəfs istəyi tüğyan edən insan bu məqamdan !necə də uzaqdır



---

.Şura» surəsi, ayə ٢٣» [۵١] -١

Ayətəl-kürsüdə oxuyuruq: «Hər kəs tağutu inkar edib Allaha iman gətirərsə qırılmaz ipdən yapışıb»(١). «Loğman» surəsinin ٢٢-ci ayəsində buyurulur: «Kim yaxşı əməl sahibi olub özünü Allaha təslim edərsə o artıq ən möhkəm ipdən yapışmışdır». Dilimizə «qırılmaz, möhkəm ip» kimi tərcümə olunmuş söz Qur'anda «urvətül-vusqa» kimi ifadə olunmuşdur. Burada maraqlı bir nöqtə vardır. İnsan nə zaman yapışmaq üçün bir şeyə əl atır? Adi halda olan insan buna cəhd edirmi? Sözsüz ki, yalnız yıxılmaq, yuvarlanmaq .təhlükəsi ilə üzləşmiş insan nədənsə yapışıb özünü xilas etmək istəyir

Qur'an həmin ifadəni işlətməklə insanların nəzərinə çatdırır ki, onlar daim süqut etmək təhlükəsi ilə üzbəüzdürlər. Ey insan, sən yerlə göy arasında təhlükədə qaldığın an ayaqların altında odla dolu cəhənnəm adlı bir dərə ağzını açmışdır. Bu əbədi oddan !qurtulmaq üçün sənin bircə çıxış yolun var: Allahın «qırılmaz ipindən» yapışmaq

Yalnız özünü daim təhlükədə bilən və çıxış yolunu Allaha üz tutmaqda görən insan Allaha təslim ola bilər. Məhz bu məqamda insan aciz bir halda yalvarır: Allahım, məni ...qoru

.Təbii ki, qeyd olunmuş halda olan insan öz əməllərinə diqqətli olacaqdır

Ürvətül-vusqa»nın oxşarı olan digər bir Qur'an ifadəsi də vardır: «İ'təsimu bihəblillah».» Bu ifadə ilə «Ali-imran» surəsinin ١٠٣-cü ayəsində rastlaşırıq: «Hamınız bir yerdə Allahın .«ipindən möhkəm yapışın və parçalanmayın



---

.Bəqərə» surəsi, ayə ٢٥٦» [٥٢] -١

İ’tisam» «yapışmaq» kimi tərcümə olunsa da əslində «sığınmaq», «pənah aparmaq»» mə’nasını verir. İnsan dünya və axirət çətinliklərindən qurtarmaq üçün yalnız Allahdan .kömək ala bilər. Bu ehtiyacı anlayan insan Allahın ətəyindən yapışacaqdır

Şeytan yalnız Allahı unutmuş insana yol tapır. Özünü təhlükədə hiss edən insan isə Allahı unuda bilməz. Daim bu düşüncədə olan insan İslamda xüsusi qeyd olunan «yəqin» məqamına çatır. Əbədi cəhənnəmin mövcudluğuna yəqini olan insan çıxış yolunu Allaha pənah aparmaqda görür. Yəqinə çatmış insanın qəlbi imanla dolu, .əməlləri saleh olur

.Ya Rəbb, belə bir ali məqama çatmaq üçün bizə kömək ol

Bildiyimiz kimi, imanın mərtəbələri vardır və insanlar dini həqiqətləri eyni dərəcədə dərk etmir. Əgər insan ali bir hədəfə çatmaq istəyindədirsə əvvəlcə bu hədəfi tanıyıb ona dərindən inanmalıdır. İkinci iş həmin hədəfə çatmaq üçün lazımi dərəcədə səʹy göstərməlidir. Məʹrifəti və imanı zəif olanlar bu zəifliyi aradan qaldırarlarsa daha çox səʹy göstərə bilərlər. Amma hətta dünya işlərində himməti və çalışqanlığı zəif olanlar əlverişli məʹrifət şəraiti yaransa da irəli gedə bilməzlər. Bu insanlar əvvəlcə doğru yol .seçməlidirlər

İmam Sadiq (ə) şiələrdə ilahi himmət və çalışqanlıq görmək istəyir. İmam (ə) onların nəzərinə çatdırır ki, yalnız əbədi əzabdan qurtulmaq üçün göstərilən səʹylər aşağı iman mərtəbəsinə aiddir. Amma yuxarı iman mərtəbəsində olanlar qəbr əzabı və bərzəx haqqında da düşünürlər. Bundan da yuxarı mərtəbədə olanlar təkcə əzabdan qaçmaq yox, həm də behişt neʹmətləri üçün səʹy göstərirlər. Behiştin də öz dərəcələri vardır. Bəʹzi rəvayətlərdə buyurulur ki, behiştin Qurʹan ayələrinin sayı qədər .dərəcələri vardır. Buradan məʹlum olur ki, möʹminlərin behişt mərtəbələri də fərqlənir

Ən yüksək mərtəbədə olanlar üçün isə dünya və axirət ləzzətləri əhəmiyyətli deyil. Onlar Allaha könül verib, Onun razılığı üçün çalışırlar. Əlbəttə ki, heç kəs əzabı xoşlayıb, ləzzətə nifrət etmir. Lakin ali məqamda olanlar Allahla yaxınlıq ləzzətini bütün ləzzətlərdən üstün tuturlar. Zalım Firʹon öz möʹminə xanımını ölümlə

hədələyib Allahdan dönməyə çağırdığı vaxt bu qadın belə dua edir: «Ey Rəbbim, mənim üçün öz dərgahında-cənnətdə bir ev tik»(١). Bu imanlı xanım əzablara dözərək imanını .qoruyur, behişt ne'mətləri haqqında yox, Allah dərgahına qovuşmaq barədə düşünür

Hər insan əzab və ne'mətə əhəmiyyət vermədən Allah razılığı haqqında düşünməyə qadir deyil. Allahın razılığı olan yerdə heç şübhəsiz ki, bütün ne'mətlər də var. Amma əsl aşiq üçün bu ne'mətlərdən yox, Allahdan uzaq düşmək qorxuludur. Sözsüz ki, belə bir məqama çatmaq üçün xüsusi bir himmət və çalışqanlıq lazımdır. İnsan cəhənnəm əzabı və behişt ne'mətləri kimi düşüncələrdən əl götürüb yalnız Allahın razılığı .haqqında düşünərsə öz iman mərtəbəsini artıra bilər

## ALLAHA YAXINLIQ MƏQAMININ YOLU

Bu məqama çatmaq üçün Allahıtanıma, Ona iman elə bir səviyyədə olmalıdır ki, insan Allahın razılığını hər şeydən üstün tutsun. Bu məqama çatmaq üçün elə bu dünyadaca hazırlıq görülməlidir. Dünya məhəbbəti, nəfs istəkləri bizi bu məqsəddən uzaqlaşdıra bilər. Bu məqamı arzulayan insan ömrün hər dəqiqəsini qiymətli bilib məqsədi yolunda .çalışmalıdır. Çoxları hər şeyə hazır olsa da ali məqama çatmağın yolunu tapa bilmir

İmam Sadiq (ə) Allahla yaxınlıq məqamına çatmaq istəyənlərə yol göstərir: «Cəlal sahibi olan Allahınla yaxınlıq istəyirsənsə xəlq olunmuşlar arasında Allaha ən yaxın olmağa çalış, heyvani alçaq məqamdan uzaqlaş, mö'minlər arasında yüksəlib elə bir məqama çat ki, bu



---

.Təhrim» surəsi, ayə ١١» [٥٣] -١

məqam yaranmışlar üçün son yüksəklik olsun. Dünyanı sənin nəzərində xar edəcək bir .«iş gör

Həzrətin buyuruğundan mə'lum olur ki, təkamül yolunda insan üçün ən böyük maneə dünyadır. Dünyaya məşğul qəlb hara, Allah eşqi hara? Dünya bər-bəzəyinə könül .verdikcə kamillikdən uzaqlaşan insan üçün Allahla yaxınlıq əlçatmazdır

## ÖLÜM FİKRİ VƏ AXİRƏTƏ HAZIRLIQ

Həzrət Əlinin (ə) «Nəhcül-bəlağə»sində az xütbə tapılar ki, o xütbədə dünyanın pisliklərindən danışılmasın. Amma Həzrət (ə) bəzən dünya haqqında elə təsirli ifadələr işlədir ki, oxucular üçün çox faydalı ola bilər. Xütbələrin birində dünya həyatının qısalığı suyu boşaldılmış qabın divarında qalmış rütubətə bənzədilir. Bu rütubət susuzluğu yatıra bilərmi?! Dünya axirətlə müqayisədə bu sayaq cüzi və əhəmiyyətsizdir. Başqa bir yerdə Həzrət (ə) buyurur: «Mənim nəzərimdə dünya zökəmin burun suyundan da dəyərsizdir». Başqa bir yerdə buyurur: «Dünya cüzam xəstəliyinə tutulmuş şəxsin əlindəki ölü donuzun çürümüş sümüyü kimidir». Doğrudanmı ömrün dəyərli saatlarını ağıllı insan belə mənfur bir şeyin ardınca gəzməyə sərf edə bilər?! Mömin o qədər mərifətli olmalıdır ki, dünyaya bağlılığın azdırıcı olduğunu anlaya bilsin. Dünya ona görə pislənmir ki, insan bir küncə çəkilib otursun. Söhbət dünyaya baxışdan gedir. Dünya yox, axirəti unutduran dünya pislənir. İnsan dünya bər-bəzəyinə aldanıb ölümü yaddan çıxartmamalıdır. Ölümü daim xatırlayan insan şeytana aldanıb nəfs istəklərinə təslim olmur. İmam Sadiq (ə) Əbdullah ibn Cündəbə buyurur: «Daim gözünün .«qarşısında durmuş kimi ölümü xatırla

İnsan yalnız o zaman dünyanın caynağından qurtula bilər ki, gələcəyə aid arzularını uzun-uzadı etməsin. Sabaha çıxacağına əmin olmayan insan əslində yaşadığı günün ehtiyaclarını düşünə bilər. İnsanın gələcəyə aid düşüncələri yalnız axirətə aid ola bilər. Mö'min bu günündən artıq qalanı ehtiyata saxlayıb ehtiyaclılara çatdırmalıdır. Məsələn, ilin xərcindən artıq qalan pulu ya xərcləmək, ya da Allah yolunda sədəqə vermək lazımdır. Qəlbində Allah eşqini diriltmək istəyənlər bu göstərişlərə əməl .etməklə dünyaya bağlılıqdan qurtulmalıdırlar

Peyğəmbər (s) səhabəsi həzrət Səlman kimi insanlar üçün dünyanın bu günü ilə sabahı arasında fərq olmayıb. Bu insanlar bir illik ehtiyaclarını qabaqcadan toplasalar da dünyaya bağlı olmayıblar. Amma dünyaya bağlılığı qəlbindən çıxarmaq istəyən zəif imanlı insanlar gələcəyi fikirləşmək əhval-ruhiyyəsini özlərindən uzaqlaşdırsalar yaxşıdır. Bə'ziləri elə düşünür ki, sədəqə və bəxşiş verməklə sərmayə azala bilər. Həzrət İmam (ə) isə belə buyurur: «Dünyada qoyub getdiyinin sənin üçün faydası .«yoxdur. Faydalı olan axirət yolunda xərclədiklərindir

İnsanların dünya həyatına nəzər salsaq hamının nəticə ardınca gəzdiyini görərik. Əgər bir şəxs bütün günü işləyib günün sonunda aldığı zəhmət haqqını çölə atarsa, onun bu hərəkətini məntiqi adlandırmaq olmaz. İnsan hökmən işə başlayarkən hansısa məqsəd güdür; o, zəhmətinin qazancını Allahının razılığını qazanmaq məqsədi ilə bir başqasına da verə bilər. Amma xəsis və paxıl insanlarda çox maraqlı bir hal müşahidə olunur. Onlar min bir zəhmətlə qazandıqları pulu ailə-övladları və öz boğazlarından kəsərək xəzinə toplayır, nəhayət, dünyada qoyub gedirlər. Bə'zən bu xəzinələr elə .adamların əlinə düşür ki, cəmiyyət üçün zərərli işlərə xərclənir

Başqa bir qrup insan nəfsani istəklərin əmri ilə öz zərərinə çalışır. Belə insanların daxili düşməni olan nəfs onların gözünü, qulağını bağladığından bədbəxtliyə doğru hərəkətlərindən xəbərsiz qalırlar. Onlardan «nə üçün düşmənə qulaq asırsan?» -deyə .soruşsan təəccüb edərlər. Bu insanlar anlamır ki, insanın ən böyük düşməni nəfsdir

### ALLAHA E'TİMAD SAYƏSİNDƏ QURTULUŞ

Hətta dindar olmayan bir insan ağlını işə salsa görər ki, var-dövlət toplayıb dünyada qoyub getmək ağılsızlıqdır. Amma bə'zi məsələlər var ki, Allaha iman gətirmədən bu məsələləri anlamaq olmur. İmanlı insan Allaha təvəkkül və təslim, onun qəzavü-qədərindən razılıq hesabına dərin mə'naları asanlıqla dərk edir. Əgər e'tiqadsız insan bir

ehtiyacla üzləşirsə, ani olaraq özünün, dostları və yaxınlarının imkanına ümid edir. Amma imanlı insan istənilən bir çətinliklə üzləşən kimi dərhal Allahı xatırlayır. Kamil dini tərbiyə almamış insanlar bir işin həyata keçməsi üçün Allahı yox, özünü tə'sirli bilir. Amma din insana öyrədir ki, hədəfə çatmaq üçün sərf etdiyimiz bütün qüvvə və vasitələri tə'sirli edən Allahdır. İnsan çalışmalıdır ki, hər şeydən qabaq Allaha ümid etməyi bacarsın. Bu o demək deyil ki, insan oturub baxmalı, Allah isə iş görməlidir. Allah heç bir vasitə olmadan ehtiyacları ödəməyə qadir olsa da insan çalışmalı və vasitələrdən istifadə etməklə təkamül yolunu keçməlidir. Əgər insan özü çalışıb ruzi qazanmasa onun halal və harama münasibəti bilinməz. İnsan vəzifəsinə əməl etməklə inkişaf edir. Amma o, unutmamalıdır ki, Allahın razılığı olmasa bütün vasitələr .tə'sirsizdir. İnsan əvvəl Allahdan yardım istəyib sonra işə girişməlidir

İnsanı hərəkətə gətirən ya dünya, ya da axirət istəyidir. Amma hər iki istəyin gerçəkləşməsi Allahdan asılıdır. Allahın yardımına ümid bağlayaraq işə girişənlər bir çox çətinlikləri asanlıqla adlaya bilirlər. Yə'ni özünə yox, Allaha arxayın olanlar daha .asanlıqla müvəffəqiyyətə çatırlar

Çətinlik zamanı bu Qur'an ayəsini xatırlamaq faydalıdır: «Məgər Allah öz bəndəsinə kifayət deyilmi?!»(۱). Allahın qüdrət və əzəmətini xatırlayan insan bu əzəmətə .sığınmaqla ən böyük çətinliklərdən asanlıqla çıxır

Amma insanlar adətən, çətinlik üz verən kimi ən qadir xeyirxahını yaddan çıxarıb özü kimi çarəsiz insanlardan



---

.Zumər» surəsi, ayə ۳۶» [۵۴] -۱

kömək umur. Məsələn, uzaq səfərə çıxmış kişi öz ailə-uşağından ötrü nigaran olur. O, nədən nigarandır? Yoxsa elə hesab edir ki, bu ailəni qoruyan odur? Bəlkə özünü bu ailə ?üçün yeganə qəyyum bilir

Ailədə məhəbbət təbii hissdir. Amma bu məhəbbət o qədər ifrata varmamalıdır ki, Allah unudulsun. Əgər övlad xəstədirsə ata istər yaxında olsun, istər uzaqda, heç bir fərqi yoxdur. Xəstənin şəfa tapması ilk əvvəl Allahdan asılıdır. Allah səbəb salmayan yerdə həkim-dərman səmərəsizdir. Ruzi də belədir. Çox ailələr kişisi evdə oturduğu halda aclıq çəkir. Çünki ruzi verən kişi yox, Allahdır. Bütün bu xırdalıqları düşünən insan .ailədən uzaq düşdükdə Allaha dua etməklə rahatlıq tapa bilər

## NE'MƏTLƏR VƏ BƏLALAR QARŞISINDA ŞÜKR VƏ SƏBR

Dünyada baş verənlər iki halda ola bilər: istəyimizə uyğun və ya istəyimizin ziddinə. Sağlamlıq, rifah, rahatlıq, yaxşı hava, meşə, şəlalə könlümüzü oxşayır, xəstəlik, kasıblıq, tənhalıq isə bizə sıxıntı gətirir. Həyatımız isə bu zərurətlərlə doludur. Bütün həyatı yalnız əzabdan və ya yalnız ləzzətdən ibarət olan insan yoxdur. Kimi xəstəlik, kimi kasıblıqla imtahana çəkilir. «Bələd» surəsində buyurulur: «Biz insanı məşəqqətdə .«yaratdıq

İnsan ne'mətlərə şükr edərsə bu ne'mətlər artar, bəlalara səbr edərsə Allahın razılığını qazanar. Doğru yolu getmək istəyən insan unutmamalıdır ki, hər bir çətinlikdən sonra rahatlıq gəlir: «Bəli, hər çətinlikdən sonra bir yüngüllük gəlir»(١). Bu məsələyə diqqət etməyən



---

.İnşirah» surəsi, ayə ۶» [۵۵] -١

insan dünyada rahatlıq, axirətdə səadət görməyəcəkdir. Səbr etməyən insan üçün adi çətinliklər böyük faciələrə çevrilir. Səbr etməyi bacarmayan insan zəif insandır. İmam Sadiq (ə) mö'minlərə buyurur: «Hər bəla üçün səbr, hər ne'mət üçün şükr etməyib çətinlikdən sonra asanlıq gözləməyən aciz adamdır».

## DÜNYA HƏYATININ ACILIQLARI

İnsan həyatı dərd-bəla, ağrı-acısız ötüşmür. Bu çətinliklərlə üzləşmək bütün insanlar üçün labüddür. Övlad valideyndən qabaq ölərsə valideyn, valideyn övladdan qabaq ölərsə övlad dərd çəkir. Ömür boyu çətinlik görməmiş insan tapmaq mümkün deyil. Fərdi problemlərdən əlavə insan üçün təbii və ictimai çətinliklər də var. İnsan daim bu çətinliklərdən qurtarmaq üçün sə'y göstərir. Əlbəttə ki, o bir çox müvəffəqiyyətlər qazanıb. Amma aradan qaldırılmış hər bir çətinlik tamamilə yenisi ilə əvəz olunur. Məsələn, insan dənizdən neft çıxarmaqla enerjiyə olan tələbatını ödəyir. Bunun əvəzində dəniz çirklənir, yeni bir problem yaranır. Qədim dövrdə əsas nəqliyyat vasitəsi olan at təsadüfən öz süvarisini təpiklə vura bilərdi. Amma bu gün insanı bir anda mənzilinə çatdıran təyyarə süqut edərsə yüzlərlə insan öz həyatı ilə vidalaşmalı olur. Əgər bir milyonçu ilə bir əkinçinin həyatını dərindən müşahidə edə bilsək, əkinçinin fiziki və psixoloji durumu qibtə doğurar.

İstisnasız olaraq bütün insanlar çətinlik çəkir və bu, dünya həyatının səciyyəvi xüsusiyyətidir. Axirət həyatı

.(isə belə deyil: «Onlara cənnətdə heç bir yorğunluq üz verməz»(١

Bəşər öz həyatını rahatlaşdırmaq üçün daim çalışır. Amma o ruhunu unudaraq tamamilə yanlış istiqamətdə hərəkət edir. O öz mə’nəviyyatını tərbiyələndirmək əvəzinə ruhi narahatçılığını müvəqqəti aradan qaldırmaq üçün əyləncələr axtarışındadır. Hal-hazırda bəşəriyyət imansızlıqdan yaranmış ruhi sarsıntılarını spirtli içkilər və narkotik maddələrlə sakitləşdirmək istəyir. O öz ağlını məst etməklə sanki səadətin dadına baxmaq istəyir. Amma məstlikdən oyanan kimi dünya əvvəlkindən də qaranlıq görünür. O bu qaranlığın qorxusundan yenidən içir, içir, içir... və nəhayət o, iyrənc bir əski parçası tək bütün cəmiyyətin gözündən düşür. Narkotikada xoşbəxtlik axtaranlar orqanizmin tələbini yubatdıqda ən böyük cinayətə getməklə ağ ölümə .düçar olurlar

Çətinliklər qarşısında çırpınan bəşəriyyətə psixologiya tövsiyə edir ki, bu çətinliklərlə barışmaq lazımdır. Guya övladı narkotikaya qurşanmış ata bu vəziyyətlə barışıb öz rahatlığını qorumalıdır. Problemlərə belə baxış onları daha da dərinləşdirib .bəşəriyyətin süqutuna aparır

## DÜNYA ÇƏTİNLİKLƏRİNİ YALNIZ DİNİ BAXIŞ ARADAN QALDIRA BİLƏR

İnsan dini göstərişlərə əməl etməklə dünya çətinliklərindən qurtula bilər. İnsan öz var-dövlətini Allahın ona verdiyi əmanət kimi qəbul etsə bu var-dövləti itirməkdən qorxmaz. Dostunuz sizə müvəqqəti verdiyi kitabı geri alanda qəmlənirsinizmi? İnsan anlamalıdır ki, dünyada olanların hamısı müvəqqəti



---

.Hicr» surəsi, ayə ۴٨» [۵۶] -١

istifadə üçündür. Bu həqiqətləri anlayan insan heç nəyi itirməkdən qorxmur. Aydındır ki, imansız insan deyilənlərlə razılaşmayacaq. Qeyd etdiyimiz yanaşma üsulundan yalnız Allahı tanıyan imanlı insanlar istifadə edə bilər. İkinci tərəfdən, ne'mət insanlara əbəs yerə verilmir. Ne'mət verilən adam şükürlə, ne'mət əlindən çıxan isə səbrlə imtahan olunur. İslam dinində çətinlik zamanı səbr edən və ilahi ne'mətlərin şükrünü yerinə yetirən insana əbədi səadət və'd olunur. Şükr və səbr olmadan kamilləşmə .qeyri-mümkündür. Mə'rifətli insan anlayır ki, bütün çətinliklər onun təkamülü üçündür

İmam Sadiq (ə) İbn Cündəbə buyurur: «Qarşına çətinlik çıxdığı zaman özünü səbrə vadar et». Məsələn övladı, var-dövləti itirmək olduqca ağrılıdır. Dinsiz adamlar da bu itkilərə dözə bilərlər. Amma mö'minlə kafirin səbri mahiyyətcə fərqlənir. Dinsiz adam onsuz da əlindən bir iş gəlmədiyini anlayıb dözür. Amma imanlı insan dərk edir ki, Allah .öz verdiklərini geri alır və hər hansı bir narazılığa əsas yoxdur

İnsan imtahan üçün yaşayır və onun qarşısında həmişə iki yol vardır. O, bu iki yoldan birini seçməkdə azaddır. İmtahandan üzü ağ çıxan insanı əbədi səadət gözləyir. .Dindən xəbərsiz insan bütün bu incəliklərin qarşısından gözü bağlı keçir

!Yağlı dildən həzər

İnsan öz fərdi və ictimai ehtiyaclarını ödəmək üçün başqaları ilə əlaqə saxlamağa məcburdur. Əgər insan cəmiyyətlə agah və sağlam münasibətdə olsa bu əlaqələr onun dünya və axirəti üçün faydalı ola bilər. Məsələn, imanlı və savadlı insanlarla münasibət insanın qəlbini işıqlandırır, onun mə’rifətini artırır. Amma əksəriyyət belə deyildir. Cəmiyyətə çıxan adam özünü yalan, qeybət, böhtan kimi günahlardan qorumalıdır. Ətrafımızda baş verən hadisələri düzgün anlamaq və ictimai vəzifələrimizə düzgün əməl etmək üçün öz hərəkət və rəftarlarımızı dəqiq qiymətləndirməliyik. Xüsusi ilə cəmiyyətdə üstün mövqeyə malik olanlar cəmiyyətə müsbət tə’sirlərinə, xalqa xeyir verəcəklərinə, özlərini xətadan qoruya biləcəklərinə əmin olmalıdırlar. Bunlara əmin olmadan başqaları ilə münasibətləri tənzimləmək qeyri-mümkündür. Xüsusi ilə din təbliğatçıları bu nöqtələrə çox fikir verməlidirlər. Natiqlər öz nitqlərinin lent yazılarına diqqətlə qulaq asıb nöqsanları aradan qaldırmalıdırlar. İnsanlar üzdə yaxşı münasibət göstərsələr də, əslində başqa cür fikirləşə bilərlər. Onlar müəyyən səbəblərə görə əsl düşüncələrini açıqlamaya da bilərlər. Bə’zən insan pis münasibətlə üzləşəcəyindən qorxaraq həqiqəti açıqlamır. Şagird müəllimin, fəhlə müdirin düşməninə çevrilməmək üçün həqiqi münasibətini gizlədir. İnsan özünü sevdiyindən gördüyü yaxşı işlərdən ləzzət alır. Mö’minlər isə gördükləri yaxşı işdə Allahın yardımını unutmayaraq «əlhəmdulillah» pıçıldayırlar. Bə’ziləri insandakı eqoizimdən istifadə

edərək tə’rif söyləməklə onu sevindirirlər. Çoxları yağlı dilini işə salaraq yüksək vəzifədə olanların qəlbini alır. Onların niyyəti öz məqsədinə nail olmaqdır. Cəmiyyətdə təsadüf olunan şeytani üsullardan biri budur. Ümumiyyətlə tə’rif yolu ilə məqsədə çatmaq məşhur üsuldur. Cəmiyyətdə yüksək vəzifə tutanlar bu üsullardan xəbərdar olmazlarsa cəmiyyətdə böyük fəsadlar yarana bilər. Vəzifəli şəxslər başqalarının onlara irad tutmasını gözləməməli, öz nöqsanlarına diqqətli olmalıdırlar. Ətrafdakıların yağlı tə’rifləri çox vaxt həqiqətə uyğun olmur. Yağlı tə’rifə aldananlar bir zaman .həqiqəti anlayanda artıq gec ola bilər

## YAĞLI TƏ’RİFLƏRƏ QARŞI

İnsan yağlı tə’riflərin qarşısını alıb özünü qorumaq üçün nə edə bilər? Aldanmamaq üçün nə etməliyik? Bu olduqca çətin bir işdir. İnsan özünü sevdiyindən nəsihət, danlaq ona ağır gəlir. Yalnız özünü tərbiyə etmək istəyənlər belə şirin tə’riflərə qarşı çıxa bilər. İnsan özü haqqında deyilən tə’riflərə diqqətlə yanaşıb həqiqəti axtarmalıdır. Tə’rif .deyən insana elə münasibət göstərmək lazımdır ki, bu hal bir daha təkrarlanmasın

İslam Peyğəmbəri (s) buyurur: «Sizi tə’rifləyənlərin üzünə torpaq atın»(١). Həzrət (s) mö’minlərə anlatmaq istəyir ki, tə’riflə tünd rəftar edib ona tə’rif etəməkdən ötrü .macal verməmək lazımdır

## TƏNQİDƏ DÖZÜM RUHU

İnsan özünü tənqidə dözümlülük ruhunda tərbiyə etməlidir. İnsan öz nöqsanlarını kənardakılar kimi görə



---

١- [٥٧] «Biharul-ənvar», cild ٧٣.

bilmir. Özünü tərbiyələndirmək istəyən insan üçün ətrafdakıların tənqidi olduqca dəyərlidir. İmam Sadiq (ə) buyurur: «Mənim üçün ən sevimli dost eyiblərimi mənə hədiyyə edən dostdur». Doğrudan da özünü tərbiyələndirmək istəyən adam üçün .eyibini bilməkdən böyük hədiyyə yoxdur

Yalan tə'rifə uyanları ağıllı hesab etmək olmaz. Yalan tə'rif deyənlər də belədir. Belələri, heç şübhəsiz ki, nə vaxtsa rüsvay olacaq, hətta cəmiyyətdəki azğınlara görə cavab verəcəklər. Çünki onların yalanı çirkinliyə gözəllik libası geydirərək həqiqətləri ört-basdır etmişdir. Ağıllı insan bir qarın çörəkdən ötrü belə xəyanətlərə yol verməz. .Yalan tə'riflərlə özünü sevdirmək olduqca alçaq sifətdir

## EQOİZM VƏ TƏKƏBBÜR

İnsan yağlı dil və yalan tə'rifdən qorunmalıdır. Qorunmaq üçün isə güclü iradə lazımdır. İnsan belə mənfi tə'sirlərin qarşısında yalnız psixoloji hazırlıqla müqavimət göstərə bilər. Əks təqdirdə insanda eqoizm və təkəbbür formalaşa bilər. İnsanın süqutunda təkəbbür mühüm rol oynayır. Qur'ani-Kərim Peyğəmbərlə (s) müxalifətçilik edənləri təkəbbür sifəti ilə tanıtdırır. «Ğafir» surəsinin ۶۰-cı ayəsində buyurulur: «Mənə .«ibadət etməyi təkəbbürünə sığışdırmayanlar cəhənnəmə zəlil olaraq girəcəklər

Bəli, bəla qarşısında tir-tir əsən insan bə'zən Allah hüzurunda səcdə etməyi özünə sığışdırmır. Vəzifəlilərin, güclülərin qarşısında əyildiyi halda Allah qarşısında təkəbbür göstərir. «Bəqərə» surəsinin ۳۴-cü ayəsində oxuyuruq: «Biz mələklərə «Adəmə səcdə edin» dedikdə İblisdən başqa hamısı səcdə etdi. O, lovğalanaraq

.imtina edib kafir oldu». Şeytanı alçaldan onun təkəbbürü idi

Həqiqət qarşısında təkəbbür çoxlarını uçuruma yuvarlatmışdır. Əlbəttə ki, insan birdən birə Fir᾽on ola bilməz. Çirkin təkəbbür sifəti aram-aram doğulub ərsəyə gəlib. Özünə diqqətli insan bu sifətə qarşı vaxtında mübarizəyə başlayıb çətinlik çəkmədən onun qarşısını ala bilər. Nankor olmayan insan nəinki təkəbbür göstərmir, hətta Allahın qarşısında səcdə etməkdən şərəf duyur. «Loğman» surəsinin ۱۴-cü ayəsində oxuyuruq: «Biz insana ata-anasına yaxşılıq etməyi tövsiyə etdik... Mənə və ata-anana şükr et. Axır .«dönüş Mənədir

Azca insafı olan adam valideynin, xüsusi ilə də ananın zəhmətlərini itirə bilməz. Yuxarıdakı ayədə Allah-təala nə üçün ata-ananı özü ilə birlikdə xatırladır? Çünki ata-ananın zəhməti göz qabağındadır. Ata-ananın zəhmətini qiymətləndirən şəxs Allahın .da ne᾽mətlərini qiymətləndirə bilər

Qəlbində təkəbbür ruhu möhkəmlənmiş şəxs bir addım cəhənnəmə yaxınlaşır. Yalançı tə᾽riflər onun gözlərini bağlayır və eyiblərindən xəbərsiz halda küfr yoluna qədəm qoyur. İmam (ə) buyurur: «Düşüncəsiz adamın danışığı və sitayişindən məğrur olmağa ... təkəbbürə, özünü bəyənməyə düçar olarsan. Əməllərin ən yaxşısı ibadət və .təvazödür

Ayə və rəvayətlərdə zöhd, qənaət, izzəti-nəfs, bir sözlə, mə’nəvi saflıq haqqında nəsihətlər çoxdur. Əxlaq kitablarında bu mövzuda daha ətraflı danışılır. Bu mövzu ilə əlaqədar buyuruqları hərtərəfli işıqlandırıb oxucuya çatdırmaq alimlərin vəzifəsidir.

Əsas məsələlərdən biri budur ki, insan yalnız dünya həyatı haqqında fikirləşməməli, dünya ləzzətləri dalınca qaçmamalıdır. O, bu dünyanın müvəqqəti olmasını anlayıb əbədi axirət səadəti haqqında düşünməlidir. Əslində əbədi ilə məhdudu müqayisə etmək məntiqsizdir. Əgər əbədi olan axirəti müxtəlif ulduz sistemləri və kəhkəşanların yaradılışından sonuna qədər olan bir dövrlə (bu qədər uzun müddət olmasına baxmayaraq) müqayisə etmək düzgün deyilsə, bizim dünyadakı ömrümüzlə necə müqayisə etmək olar?

Dünyanın dəyərsiz olmağı məsələsi dərin elmi, fəlsəfi və e’tiqadi nəzəriyyəyə əsaslanır.

## ÖMÜRDƏN İSTİFADƏ

Dünya həyatı qısa olsa da, bu qısa həyat insanın aqibətini tə’yin edir. İnsanın axirət səadəti məhz bu dünyada müəyyən olunur. Bu baxımdan dünya həyatımızın dəyəri çox böyükdür. Amma yaxşı nəticələr əldə etmək üçün dünya həyatının hər dəqiqəsinin qiymətini bilmək lazımdır. Təbii ki, insan öz ehtiyaclarını ödəmək üçün ömür boyu çalışır. Fərdi və ictimai vəzifələr olmasaydı insanın imtahanı da mümkün olmazdı. Seçim prosesini yaşayan insan təkamül yoluna qədəm qoyur.

.İnsan pislə yaxşı arasında yaxşını seçməklə behiştə çata bilər

Sual oluna bilər ki, insan qarşısına çıxmış işləri planlaşdırarkən hansına üstünlük verməlidir. Məsələn, gənc iki yol ayrıcında qalıb; oxumağa getsin, yoxsa işləməyə? Qur'an oxusun, yoxsa ibadət etsin? İdman faydalıdır, yoxsa istirahət? Əsas suallardan biri isə budur: dünya həyatı üçün nə qədər çalışmaq olar? Bu sualın fərdi və ictimai .baxımdan iki cavabı vardır. Fərdi baxımdan əsgərlə əkinçinin vəzifələri fərqlidir

İctimai baxımdan bu suala cavab vermək üçün iqtisadi inkişafa İslam prizmasından .baxmalı olacağıq

## İSLAM VƏ İQTİSADİ İNKİŞAF

İnsan firavan həyat, var-dövlət üçün çalışmalıdırmı? İndi bütün ölkələrdə cəmiyyəti iqtisadi böhrandan çıxarmaq üçün iqtisadi inkişaf proqramları hazırlanır. İslam iqtisadi inkişaf proqramını qəbul edirmi? İnsanlar vaxtının daha çoxunu işə sərf edib nəticədə varlı olmalı, yoxsa sadə qidalarla keçinib ibadətə üstünlük verməlidirlər? Bu mövzu konfranslarda, seminarlarda çox araşdırılır. Hətta İslamı bir neçə əsr geridə görməyi öyrənənlər dini iqtisadi inkişafla üz-üzə qoydular. Onlar öz məntiqsiz fikirlərinə .əsaslanaraq haray çəkirdilər ki, iqtisadi inkişaf gəlsə din əldən çıxacaq

Bəs həqiqət necədir? Doğrudanmı insanlara səadət yolunu göstərən bir din onları kasıbçılığa çağırır? Doğrudanmı varlı adam pis adamdır? Əgər İslam var-dövlətə belə münasibət göstərirsə nə üçün Allahın peyğəmbəri Süleyman (ə) Ondan var-dövlət istəyir? «Pərvərdigara, məni bağışla və mənə kimsənin nail ola

bilməyəcəyi mülk ver»(۱). Süleymanın büllur saraylarını XXI-ci əsrin hansı tikilisi ilə müqayisə etmək olar. Bu saraya daxil olan Bəlqis islanmasın deyə, ətəklərini qaldırır. .(Ona belə deyilir: «Bu büllurdan tikilmiş bir saraydır»(۲

Həzrət Peyğəmbər (s) və mə’sum imamlar (ə) haqqında mə’lumat verilir ki, bu ilahi şəxsiyyətlər ildə onlarla qul azad edərmişlər. Belə bir böyük iş üçün hər insanda imkan olmayıb. İmam Hüseyn (ə) bir neçə dəfə bütün var-dövlətini kasıblara paylamış, fəqirlərə çatan qədər özünə də pay götürmüşdü. İmamların sadə geyib, sadə yaşayıb, .sadə yeməsi o demək deyil ki, imamlar kasıb olub

Demək, İslam müsəlmanların varlı olmasını bəyənir. Müsəlmanı zəlil, ac, savadsız, ev-eşiksiz görmək İslamın yox, İslam düşmənlərinin istəyidir. İşləmək, qazanmaq, Allah yolunda xərcləmək olduqca böyük savaba malikdir. Amma dünyaya könül verib, dünya sərvətinə çatmaq üçün bütün müqəddəslikləri ayaq altına almaq, Allahı yaddan .çıxarmaq ən böyük bədbəxtçilikdir

İctimai və iqtisadi nəzəriyyələrdən birinə görə bu gün qərbdə sənayenin inkişaf səbəbi dindar məsihilərin uzun müddət qənaət edərək sərmayə, kapital toplaması olub. Marks isə kapitalizmin yaranma səbəblərindən biri kimi məsihiliyin üç qolundan biri .olan protestantlığı göstərir

Əsas məsələ budur ki, insan dünyaya könül verməsin. Mümkündür ki, Allah rizasına görə ağa öz sürüsündən keçə, çoban isə çomağından keçməyə. Demək, qorxu varlı olmaq yox, bu vara bağlı olmaqdır. Qənaət böyük savaba



---

.Sad» surəsi, ayə ۳۵» [۵۸] -۱
.Nəml» surəsi, ayə ۴۴» [۵۹] -۲

?məxsus xüsusiyyətlərdəndir. Heç nəyi olmayan insanın qənaət etməyə imkanı varmı

Deməkk, iqtisadi inkişaf mö᾽minlik ruhuna zidd deyil. Pul məqsədə çatmaq üçün vasitədir. Amma pulu əlinə almaqdan ləzzət duyanlar onu xərcləmək yox, toplamaq barədə düşünürlər. Qəpik-qəpik yığdığı pulları xəzinələrdə dondurub Allahın hüzuruna əliboş gedən milyonçular çoxdur! Xəzinələrdə milyardlar yığılmışkən bir qarın çörəyə möhtac milyonlar çoxdur! Xoş o insanın halına ki, ibadətdən ayrılmadan zəhmət çəkib .var-dövlət qazanır və bu var-dövlətdən ehtiyaclılara verdiyi qədər istifadə edir

## DÜNYA NE᾽MƏTLƏRİNDƏN İSTİFADƏ QAYDALARI

Ayə və hədislərdə, adətən, dünyaya bağlılıq məzəmmət olunur. Əlbəttə ki, söhbət ifrat .və təfrit bağlılıqdan gedir

Əvvəla tə᾽yin etməliyik ki, dünya ne᾽mətlərinin faydalı bir həddi varmı? Doğrudanmı ləzzətli xörəklər, gözəl geyimlər, xoş ətirlər zərərlidir? Bə᾽ziləri qəti şəkildə bildirir ki, bütün bunlar zərərlidir və onlardan istifadə edən insan mütləq cəhənnəmə gedəcəkdir. Bu olduqca yanlış fikirdir. Bə᾽zi şəraitdə mə᾽sumlar dünyanı zəhərli ilana oxşadırlarsa, digər bir şərait barədə Qur᾽an buyurur: «Bu gün pak ne᾽mətlər sizə halal edilmişdir»(١), «Allahın öz bəndələri üçün yaratdığı zinəti və təmiz ruziləri kim



---

.Maidə» surəsi, ayə ۵» [۶٠] -١

haram buyurmuşdur»(١), «Biz səmada bürclər yaratdıq, onları baxanlar üçün bəzədik»(٢).

Adətən, kənddə yaşayıb heyvandarlıqla məşğul olanlar üçün öz sağlam, çox saylı sürüsünü müşahidə etməkdən ləzzətli iş yoxdur. Allah-təala buyurur: «Onları səhər naxıra, axşam axura gətirdikdə baxıb zövq alır, fərəhlənirsiniz»(٣). Allah-təala hər şərait üçün xüsusi ne'mətlər yaradaraq dünya həyatını zinətləndirmişdir. İnsan bütün halal ne'mətlərdən istifadə etməli, şəxsi görünüşünə də fikir verməlidir: «Ey Adəm oğulları, hər ibadət vaxtı gözəl libaslarınızı geyin, yeyin-için, lakin israf etməyin, çünki Allah israf edənləri sevməz»(٤).

İkinci mühüm məsələ insanın bu ne'mətlərə qəlbən bağlı olmasıdır. Hər hansı bir ne'mətə qəlbən bağlanmaq üçün insan çox qüdrətli olmalıdır. Ayə və rəvayətlər dünyanı yox, məhz dünyaya bağlılığı pisləyir. Dünya yox, dünyaya məşğul olub Allahı unutmaq pisdir.

İnsan öz tə'siri altında olanları dünyaya bağlılıqdan xilas edə bilərmi?! Ən tə'sirli üsullardan biri ifrat və təfritdən çəkinib orta həddi gözləməkdir. İnsanı ifrat və təfritdən çəkindirəcək şərait lazımdır. Belə bir şərait olmadıqda orta həddi qorumaq problemə çevrilir.

Məsələn, yetkinlik yaşına çatmış bir gənci tərbiyə etmək üçün onunla yumşaq rəftar edib onu mə'nəvi işlərə həvəsləndirəcək şərait yaratmaq lazımdır. Hansı ki, dünya məhəbbəti nə tərbiyəçi, nə də şərait istəyir. Əgər insan tabeçiliyində olan insanlar üçün orta həddən artıq



---

١- [۶١] «Ə'raf» surəsi, ayə ٣٢.

٢- [۶٢] «Hicr» surəsi, ayə ١۶.

٣- [۶٣] «Nəhl» surəsi, ayə ۶.

۴- [۶۴] «Ə'raf» surəsi, ayə ٣١.

dünya şəraiti yaradarsa onları dünyapərəstliyə təşviq edir. İnsan bütün sahələrdə özünü normadan aşağı faydalanmağa öyrətməlidir. Dünya məsələlərində üstünlük qazanmaq həvəsi insanı küfrə endirə bilər. «Qəsəs» surəsinin ٨٣-cü ayəsində buyurulur: «Biz bu axirət yurdunu yer üzündə təkəbbürlük etməyənlərə və fitnə fəsad törətməyənlərə qismət edirik». İmam Sadiq (ə) buyurur ki, ayaqqabısına dostununkundan yaxşı bağ bağlamaq istəyən özünü yuxarı tutmaq xəstəliyinə düçar olub. İmam (ə) İbn Cündəbə buyurur: «Allahın müqəddər etdiyinə qane ol. Öz olanlarına nəzər sal. Başqalarının malik olduqlarına göz dikmə. Bax gör Allah sənə necə .«ne'mətlər verib

Adamların xarakterinə işarə olunan bir məsəldə deyilir ki, kimi bə'zi insanlar içində yarısına qədər su olan stəkanın boş yarısını, bə'ziləri isə dolu yarısını görür. Allah istəyir ki, insan dolu yarısına nəzər salıb şükr etsin. Bə'zən insan heç vaxt çata bilməyəcəyi şeyləri ələ gətirməkdən ötrü daim götür-qoy edir. Qənaət ruhiyyəsində olan heç zaman acımadığı kimi bu ruhiyyədə olmayanlar da heç zaman doymur. Onlar hesablarında pul, süfrələrində dadlı təamlar olduğu halda, ehtiyac və aclıq hissi ilə əriyirlər. Dünya şor suya bənzəyir. Onu içənin ciyəri yanır. İnsan malik olduğu şeylərin qədrini bilib qane olarsa hər zaman şad olar. Amma öz olanlarına qane olmayıb əlçatmaz arzularla qovrulanlar sevinc üzünə həsrətdir. İmam (ə) «əlində olanlardan .axirət səadətin üçün də faydalan» buyurur

## DÜNYA MALINA BAĞLILIĞIN QÜSURLARI

İnsanın dünya malına münasibəti bir neçə baxımdan araşdırıla bilər. Məsələn, əgər söhbət insanın dünya

malına məhəbbətindən gedirsə, bu malın az və ya çox olmasının heç bir əhəmiyyəti yoxdur. Əgər dünya malına məhəbbət insanın ibadəti və ictimai vəzifələrinə zərər vurursa, bu çox təhlükəli haldır. Ona görə də insan belə bağlılıqlardan qorunmalıdır. İnsan bir şey əlindən çıxdıqda qəmlənməməli, bir şey qazandıqda da sevinməməlidir. «Hədid» surəsinin ۲۳-cü ayəsində buyurulur: «Bu sizin əlinizdən çıxana kədərlənməməyiniz və sizə verilənə də sevinməməyiniz üçündür». Əlbəttə ki, bu .sözləri demək çox asandır

İnsan özünü belə bir məqama çatdırmaq üçün müxtəlif üsullardan istifadə edə bilər. O öz nəfsini tərbiyələndirmək üçün ən çox sevdiyi bir şeyi başqasına bağışlaya bilər. «Ali-imran» surəsinin ۹۲-ci ayəsində oxuyuruq: «Sevdiyiniz şeylərdən sərf etməyincə savaba .«çatmazsınız. Şübhəsiz ki, Allah xərclədiyinizi biləndir

İnsanlara əl tutmaq üçün çalışmağın bir şərti var. Aydındır ki, başqalarına əl tutmaq müstəhəb, bir çox vəzifələr isə vacibdir. Müstəhəb iş vacib işə mane olmamalıdır. Məsələn, təhsili buraxıb pul qazanmaq və onu başqalarına paylamaq düzgün sayılmır. .Vacib işin tərk olunmasına gətirən müstəhəb işə icazə verilmir

Mümkündür insan ixtiyarında olan var-dövlətdən istifadə etməsin. Burada müxtəlif məqsədlər ola bilər. İnsan paxıl olduğu üçün yığdığı var-dövlətdən istifadə etməyə qıymaz. Amma başqa bir səbəb də ola bilər. Mümkündür ki, insan dünya ləzzətlərinə adət etməmək üçün qazancına toxunmasın. İnsan birdən-birə qula çevrilmir. O, öz bütünə asta-asta vərdiş verir. İnsan dünya malından az istifadə etməklə onun məhəbbətindən

amanda qala bilər. Ümumiyyətlə, qənaət və az xərclə dolanmaq övliya sifətidir. Sərvətli adam zahid də ola bilər. Misilsiz var-dövlətə malik olan həzrət Süleyman öz .əlinin zəhməti ilə ərsəyə gətirdiyi arpa çörəyi yeyərdi

İnsanı dünya malına bağlayan digər bir əlaqə zəif əxlaqi sifətlərdir. Yalnız zəif əxlaqlı insanlar dünya malını dəyərli bilib onun ardınca qaça bilərlər. Hər hansı itki səbəbindən .qəm-qüssəyə batmağın da bir səbəbi zəif əxlaqdır

Əgər insanın dünya malına məhəbbəti olmasa və yalnız vəzifələrinin icrası üçün dünyadan istifadə etsə heç zaman dünyaya könül verməz. İstər varlı insanın Allah yolunda infaqı, istərsə də imkansızlıq qarşısında insanın səbri böyük ibadətlərdən sayılır. Axirəti düşünən insan var-dövlət tapıb onu itirməkdən qorxmur. İmam Sadiq (ə) .«buyurur: «Böyük var-dövlət və güc səni məst etməsin

Allah sevincdən özünü itirənləri xoşlamır»(۱). İnsan var-dövlətini əldən verdikdən» sonra bədbin olarsa Allahın sevgisindən məhrum olar. «Məaric» surəsinin ۱۹-۲۲-ci ayələrində buyurulur: «Həqiqətən insan çox həris və tamahkar yaradılmışdır; ona bir pislik üz verdikdə fəryad qoparır, xeyir nəsib olduqda isə xəsislik göstərir. Namaz .«qılanlar istisnadır

səh:۱۵۰

---

.Qəsəs» surəsi, ayə ۷۶» [۶۵] -۱

Mö’minin mö’minlə əlaqəsi

Əxlaqi məsələlərdən biri müxtəlif xüsusiyyətlərə malik insanlar arasındakı əlaqələrdir. İnsanlar bu münasibətlərdə bə’zən ifrat, bə’zən isə təfritə gedərək orta səviyyəni gözləməkdə çətinlik çəkirlər. Bə’ziləri çox soyuq olduqlarından heç kim onlarla ünsiyyət saxlamaq istəmir. Amma bə’ziləri o qədər tez tə’sir altına düşürlər ki, hamı onlara yaxınlaşmağa çalışır. Amma İslam orta həddi tövsiyə edir. İnsanlar bir-birlərindən faydalanmaq üçün qarşılıqlı münasibətdə olmalıdırlar. Əgər hamı soyuqqanlı olarsa ictimai birliklər yaranmaz. Əgər bir insan digər insan üçün ?ne’mətdirsə, nə üçün biri o birindən uzaq durmalıdır

Amma asanlıqla tə’sir altına düşmək də bir xüsusiyyətdir. İnsan öz şəxsiyyətini qorumalı, hər deyiləni qəbul edib hər əmrə baş əyməməlidir. İfrat yumşaqlıq insanı başqalarının nəzərində alçaldır. Demək, insan nə həddindən artıq soyuq, nə də həddindən artıq mülayim olmalıdır. O, elə rəftar etməlidir ki, onunla ünsiyyət maraqlı .və bu ünsiyyət hər iki tərəfin Allaha yaxınlaşmasına səbəb olsun

Hər bir insanın yaş, irs, fiziki və mə´nəvi iste’dad, ictimai mövqe kimi xüsusiyyətləri vardır. İnsanın qurduğu ictimai mövqedən həm yuxarı, həm də aşağıda digər ictimai təbəqələr mövcudur. İnsan özündən aşağıda və yuxarıda olanlarla hansı münasibətdə ?olmalıdır

Hamını eyni bir səviyyədə bilmək yanlış fikirdir. Müəllimlə şagird, müdirlə fəhlə, ata ilə övlad arasında

inkarolunmaz fərqlər vardır. İslamda hamının bərabər olduğunu əsas gətirərək əsgərin komandirə tabe olmaması tamamilə məntiqsizdir. Rəvayətdə buyurulur: «Bütün müsəlmanlar darağın dişləri tək bərabərdirlər»(۱). Lakin bu rəvayətdə müxtəlif ictimai vəzifəyə malik müsəlmanlar yox, Allah qarşısında ümumi bəndəlik nəzərdə tutulur. İctimai işdə rəhbərlik məs'uliyyəti daşıyan müsəlmana itaətsizlik ümumi işi müvəffəqiyyətsizliyə aparır. Bu itaətsizlik adətən zəif iradəli insanlarda baş verir. Öz zəifliyini ört-basdır etmək istəyən insan bir pillə hündürdə dayanan müsəlmana qarşı çıxıb «mən səndən əskik deyiləm» demək istəyir. Amma tabeçilikdə olan şəxsin e'tirazı .haqlı da ola bilər

Amma bütün bu zərurətlər müsəlman cəmiyyətinin xeyrinə olduğu üçün hər müsəlman öz vəzifəsinə əməl etməlidir. Mö'min insan nəfsani istəklərə uyub .tabeçiliyində olduğu şəxslə dava-dalaşa yol vermədən öz vəzifəsinə əməl etməlidir

İnsan özündən aşağıda dayananlara həqarət gözü ilə baxmamalıdır. Allah-təala Qur'ani-Kərimdə buyurur: «Bir qövm digərini lağa qoymasın. Ola bilsin ki, lağa .(qoyulanlar lağa qoyanlardan daha yaxşı olsunlar»(۲

Ey böyük vəzifələrdə işləyənlər! Sizə tabe olanlarla insani rəftar edin! Sizin otağınızı süpürən o qarayanız yeniyetmə Allahın lütfü və öz iste'dadı ilə daha uca mərtəbələrə qalxa bilər. Bu gün elə edin ki, sabah onun məhəbbətli baxışları qarşısında xəcalət .çəkməyəsiniz



---

.Biharul-ənvər», cild ۷۸» [۶۶] -۱

.Hucərat» surəsi, ayə ۱۱» [۶۷] -۲

Çox az müsəlmanlar imam və rəhbər qarşısında ciddi məs’uliyyət hiss edirlər. Söhbət sırf İmam Zaman (ə) canişinindən getmir. Mövzuda hər hansı bir qrupa və işə ədalətlə başçılıq edənlər nəzərdə tutulur. Cəmiyyətdə iki cür rəhbər və müdirlə rastlaşırıq: tutduğu vəzifəyə layiq olanlar və layiq olmayanlar. Cəmiyyət ləyaqətsiz insanların rəhbərliyinə yol verməməlidir. Amma ləyaqətli rəhbərlərə itaət etməklə cəmiyyətin problemlərini aradan qaldırmaq zəruridir. Bütün insanlar səhv etdiyi kimi, müdir də səhv edə bilər. Təsadüfi bir səhvə görə ləyaqətli bir insanı işdən uzaqlaşdırmaq olmaz. «Ənfal» surəsinin ۴۶-cı ayəsində buyurulur: «Allah və onun peyğəmbərinə itaət edin. Bir-birinizlə çəkişməyin, yoxsa qorxub zəifləyər, gücdən düşərsiniz».

Bə’ziləri elə güman edirlər ki, təvazö hər əmrə tabe olub, hər deyilənlə razılaşmaqdır. Bu təvazö yox, ağılsızlıqdır. Belə bir hərəkət insanın iste’dadlarını öldürür, onu müqəvvaya çevirir. Bəli, insanı eqoizmdən, təkəbbürdən, yersiz müxalifətçilikdən çəkindirən təvazö kamil insanlara məxsus fəzilətdir. Şeytanı məhv edən özünü böyük bilməsi oldu. Çox böyük insanlar, hətta din alimləri təkəbbür ucbatından uçuruma yuvarlanıb. İnsanın ifrat təvazösü də təkəbbür kimi düşməndir. İfrat dərəcədə təvazökar olan insanlar cəmiyyətdə layiq olduqları mövqedən məhrum olurlar. Belə insanların bir küncə çəkilib oturması cəmiyyətə çox böyük zərbə vrur.

Həzrət (ə) buyurur: «İnsan öz tövhidi (dini) baxışında başqalarına ümid etməyib, yalnız Allaha bağlanıb, Ondan kömək istəməlidir. Diqqətini Allaha yönəldən şəxs insanlara möhtac olmaqdan qurtulur və

onun iste'dadları çiçəklənir. Allahla bağlılıq gücləndikcə insanın ictimai şəxsiyyəti ucalır .və o, başqalarına əl açmamaqla hörmətə çatır

İnsan adətən, nəfsinin vəziyyətindən, niyyətlərindən, ətrafındakı hiylələrdən xəbərsiz olur. O, təbii, psixoloji, ictimai şəraitdən doğan bə'zi səciyyəvi hərəkətlərə yol verir. Onun yeməyi, danışmağı, rəftarı çox vaxt bu şəraitdən asılı olur. Ətraf mühitin diktəsi ilə hərəkət edən insan çox vaxt bu hərəkətləri ölçüb-biçmədiyindən səhvlərə yol verir və sonradan peşman olur. Oturuşu, duruşu, danışığı, rəftarı ona əzab verməyə başlayır. Bu ağrılardan qaçmaq üçün insan iş görməzdən əvvəl öz ağlını işə salıb, əvvəlcə düşünüb, sonra hərəkət etməlidir. İmam Sadiq (ə) öz səhabələrinə buyurur ki, heç zaman tələsik iş görməyin. Səbr edib bu işin faydasının zərərindən çox olduğuna !əmin olun

Bu göstərişlər təkcə dini yox, dünya həyatına da aiddir. Mö'min isə həm dünya, həm də axirət işlərinin faydalılığını düşünür. O anlayır ki, bir saat dünya ləzzətinə görə insan əbədi olaraq cəhənnəmə gedə bilər. Xeyir və zərəri götür-qoy edən insan heç zaman günaha yol verməz. Məsələn, şərab içən şəxsə «içmək olmaz» deməklə zahirən dini vəzifə bitir. Amma şərabxora bir insan kimi ürək yandıran müsəlman ağlını işə salıb elə bir iş görə bilər ki, qarşısındakı günahkar qəflət yuxusundan oyanıb normal həyata .qayıdar

Mö'min müsəlman ağıllı və uzaqgörən olub tədbirlə iş görməli və öz ilahi məqsədinə .nail olmalıdır

Qur’ani-Kərimdə qəlb, əql və nəfsin insana aid xüsusiyyətlər olması bəyan olunur. «Yusif» surəsinin ۵۳-cü ayəsində buyurulur: «Rəbbinin rəhm etdiyi kimsə istisna olmaqla nəfs pis işlər görməyi əmr edər». Bu ayədə nəfs mənfi tanıtdırılır. Amma bə’zən o sevgi ilə yad edilir: «Ey arxayın nəfs, dön rəbbinə, sən Ondan, O da səndən razı halda»(۱).

Əvvəla, nəfs İslamda mühüm mövzulardandır və müxtəlif mə’nalarda işlənir. İmam Sadiq (ə) buyurur: «Qəlbini özünə elə yaxın et ki, sanki onunla şəriksən. Ağlını ata yerində bilib əlindən tut və ardınca get. Nəfsinə isə vuruşacağın düşmən kimi bax».

Çoxları sanki bilərəkdən bütün bu deyilənlərin ziddinə gedir. Ağlın yerinə nəfsi rəhbər seçir. Hansı ki, İslam nəfsə yox, əqlə itaət etməyi tapşırır. Biz insanlar adətən daxilimizi qoyub zahirimizlə maraqlanırıq. Bə’zən işin əsl məqsədi yaddan çıxır və insan nəfsin komandanlığı altında tər tökür. Məsələn, yaxın bir adamı nəsihət etmək istəyən şəxs əvvəlcə öz istəyini qiymətləndirməlidir. Görən, məqsəd insanlıq vəzifəsini yerinə yetirmək, yoxsa ağıllı görünməkdir?

Əxlaq alimləri özünü düzəltmək istəyənlərə çox ciddi şəkildə tapşırırlar ki, iş görməzdən əvvəl niyyətə fikir vermək lazımdır. İlahi məqsədlə işə başlayanlar üçün bir çox çətinliklər artıq geridə qalmışdır. Şəriki tərəfindən aldanmaq istəməyən insan ilk əvvəl öz qəlbini şeytan vəsvəsələrindən pak etməlidir. Əks təqdirdə daha böyük problemlərlə qarşılaşmaq olar.



---

۱- [۶۸] «Fəcr» surəsi, ayə ۲۷-۲۸.

Bunu da qey edək ki, İslamın bə’zi bölmələrində əql və nəfs müxtəlif mə’nalarda işlədilir. Əxlaq mövzusunda əql insanı doğruya, nəfs isə süquta çəkir. Əlbəttə ki, xoşbəxt olmaq istəyən insan yaxşıların ardınca gedəcək. Uşaq atanın əlindən tutduğu kimi, əqlin əlindən tutub çətinliklərdən keçməliyik. Səadət yolunda bizə maneə olmuş .nəfs isə daim hədəfdə olmalıdır

Unutmaq olmaz ki, nəfs insanı ləzzətlərlə aldadır. Ağıllı insan anlayır ki, nəfsin ötəri ləzzətləri arxasında cəhənnəm öz qapılarını açmışdır. Nəfsin insana təqdim etdiyi .bütün ləzzətlər ani, amma axirət ləzzətləri misilsiz və əbədidir

Allahla ünsiyyət, Onun mə’rifətini dadmaq, övliyaları ilə görüşmək əbədi bir ləzzətdir. Bu gün duyduğumuz nəfsani ləzzətlər axirət aləmi ilə müqayisədə yuxudan artıq bir şey deyil. «Fəcr» surəsinin ۲۴-cü ayəsində buyurulur: «İnsan deyəcək: «Ey kaş, əvvəlcədən axirət həyatım üçün bir iş görəydim». «Ənkəbut» surəsinin ۶۴-cü ayəsində isə belə buyurulur: «Bu dünya həyatı oyun-oyuncaqdan, əyləncədən başqa bir şey deyil. Axirət aləmi isə şübhəsiz ki, əbədi həyatdır». Gözlərini dünyaya qapayan insan əbədi həyata düşdüyünü anlayır. İnsan bilməlidir ki, nəfsin şirin və’dləri yalnız ölümə .qədərdir

İmam Sadiq (ə) buyurur: «Sən özün-özünə həkim olmalısan. Həm dərdin, həm də .«...dərmanın sənə tanıtdırılıb. Aqil insan heç zaman sağlamlığı qoyub dərdi götürməz

### MİNNƏT SAVABI PUÇA ÇIXARIR

Bütün əməllərin düzgünolma və qəbul şərtləri vardır. Oruc tutarkən bu şərtlərə əməl etməsək onun qəzasını

tutmağa məcburuq. Amma əməlin qəbul olması üçün başqa şərtlər də vardır. Əgər bu şərtlərə əməl olunmasa hətta düzgün yerinə yetirilmiş əməl üçün axirət savabı gözləməyə dəyməz. Yaxşı, bəs bir mö'min həm düzlük, həm də qəbul şərtlərinə əməl etmişsə yenə də axirət üçün qorxu qalırmı? Diqqət etməliyik ki, çirkin bir iş əvvəlki savabı puça çıxara bilər. Tövbə günahı yuyub apardığı kimi, pis iş də savabı puça çıxara bilər. Məsələn, riya bütün savabları məhv edə bilər. «Hucurat» surəsinin ۲-ci ayəsində buyurulur: «Ey iman gətirənlər, səsinizi peyğəmbərin səsindən artıq qaldırmayın və bir-birinizlə ucadan danışdığınız kimi onunla ucadan danışmayın! Yoxsa, özünüz də bilmədən əməlləriniz puç olar». Bir mö'min saf niyyətlə yardım əlini uzadıb savab qazanır. Amma bir neçə il ötəndən sonra etdiyi yaxşılığı onun üzünə vuraraq əvvəlki savabı puça çıxarır. «Bəqərə» surəsinin ۲۶۴-cü ayəsində oxuyuruq: «Sədəqələrinizi malını riyakarlıqla xərcləyən kafir kimi, minnət qoymaqla puça !çıxarmayın». Minnət yaxşılığı puça çıxarır

İmam Sadiq(ə) buyurur: «Birinə əl tutmusansa minnət qoymaqla puça çıxarma, əksinə, .daha yaxşı bir iş gör ki, əxlaqın gözəlləşsin, axirət savabın artsın

## DİL BƏLASI

İmam Sadiq (ə) buyurur: «İnsanda təbii meyllərdən biri özünü göstərmək, tanıtmaqdır». Məsələn, uşaq bir şey eşitdikdə onu hamıya danışmaq istəyir və bununla da özünü hər şeydən başı çıxırmış kimi göstərir. Əslində uşağa aid olan bu xüsusiyyətə yaşlı adamlarda da təsadüf olunur. Amma özündə İslami əxlaqi cilvələndirmək istəyənlər belə xüsusiyyətlərlə mübarizə aparır

və riyadan uzaq olmağa çalışırlar. Uşaq isə hətta namaz qılanda da başqalarından .tə’rif umur

Əqli yetkinliyə çatmamış insan uşaq kimidir. O, namaz qılarkən yalnız Allahın razılığını düşünməli olduğunu bilsə də yenə də başqalarının nəzərini güdür. Bu bəladan qurtulmağın səmərəli yollarından biri az danışmaqdır. Adətən, dilini boş saxlaya bilməyənlər elə öz danışıqları ilə xalis niyyətdə olmadıqlarını bildirirlər. Böyük İslam alimlərindən bə’zilərinin bir ömür yaşadığı şəhərdə onların elmi səviyyəsindən !?xəbərsiz qalıblar. Müctehid özünü necə aparmalıdır ki, adi bir ruhani tək tanınsın

Az danışmaq sözbazların belini qırır. Çünki sözbazlar cəmiyyəti çox danışanların dili ilə qarışdırırlar. Az danışmağın digər bir xeyri qəzəbin qarşısının alınmasıdır. .Həyəcanlanmış insanın danışığı adətən davaya səbəb olur

İmam (ə) buyurur: «İstər bildiyin, istərsə də bilmədiyin halda sükuta riayət et. Əgər belə etsən səbrli və həlim insan sayılarsan və bu sükutun sənin üçün alimlər yanında .«zinət, nadanlar qarşısında örtük olar

səh:۱۶۱

Bə'zən böyük İslam alimləri öz söhbətlərində başqalarından sitat gətirirlər. Biz də danışanın adını qeyd etməklə deyiləni olduğu kimi çatdırmalıyıq. İmam Sadiq (ə) bir əxlaq nöqtəsini öz şiələrinin nəzərinə yetərincə çatdırmaq üçün həzrət İsadan (ə) bir .əhvalat nəql edir

Həzrət İsa (ə) öz həvarilərindən soruşur: «Əgər dostlarınızdan biri yatdığı zaman üstü açılıb ayıb yeri görünərsə, siz nə edərsiniz?». Həvarilər belə cavab verdilər: «Çalışarıq ki, üstünü örtək». Həzrət İsa (ə) buyurdu: «Yox, siz belə etməzsiniz». Həvarilər çox təəccübləndilər. Amma anladılar ki, burada nə isə bir sirr var. Həzrət İsa (ə) onları anlatmaq istəyirdi ki, təkcə eybi örtmək yox, bu barədə kimsəyə danışmamaq da lazımdır. Həvarilər unutdular desinlər ki, onun üstünü örtəndən sonra bu barədə .susmaq lazımdır

Müsəlman başqasının eybini açan yox, örtən şəxsdir. Bə'ziləri bu işi əmr be mə'ruf və nəhy əz münkərə zidd başa düşürlər. Hansı ki, bir şəxsin eybini aradan qaldırmaq üçün .onunla xəlvətdə, ilk əvvəl işarələrlə danışmaq lazımdır

## NƏFSİN İSTƏKLƏRİ İLƏ MÜBARİZƏ

Maddi və mə'nəvi ne'mətlərə çatmaq üçün müəyyən vasitələrə ehtiyac vardır. Bu vasitələr iki cürdür: zəruri və tərk ediləsi. Bə'zən bu məqsədə çatmaq üçün bə'zi zəruri işlər görmək lazım gəlir. Məsələn, aclığı aradan qaldırmaq üçün yemək və qab-qacağa .ehtiyac vardır

Alim olmaq istəyən cahil dərs oxumaq üçün ləvazimatlar əldə etməlidir. Amma bə'zən elə olur ki, məqsədə çatmaq istəyən adam birinci dərəcəli vasitələrə üstünlük verir. Məsələn, mə'nəvi kamilliyə çatmaq istəyən adam haramdan çəkinməzdən əvvəl .vaciblərə əməl etməyə başlayır

Qeyri-maddi hədəfə malik olan din, məzhəb və sektalarda təkamül üçün müxtəlif proqramlar nəzərdə tutulur. Əksəriyyəti özünü arif hesab edən buddistlər riyazət kimi .çətin bir işlə məşğul olduqları halda elementar qadağalara məhəl qoymurlar

Ali məqsədə çatmaq üçün vacib əmrlərə itatlə yanaşı, haram işləri də tərk etmək lazımdır. Məsələn, xəstə dərman qəbul edib bə'zi xörəklərdən imtina etməklə sağala .bilər. Mə'nəviyyatda da belədir. Bu hal İslam cəmiyyətlərində də müşahidə olunur

Gecə gündüz ibadət edib, eyni zamanda günaha da yol verən insan deşik vedrə ilə su daşıyana bənzəyir. Yə'ni əzab-əziyyətlə uzun yol gəlib mənzilə çatanda baxır ki, vedrə boşdur. Ali məqam arzusunda olan adam vacibə əməl, haramdan çəkinmə, .müstəhəbbə bağlılıq və məkruhdan uzaqlıq mərtəbələrini keçməlidir

Kamillik eşqində olan adam nəfsi ilə mübarizə aparmalıdır. O öz hərəkətlərində nə ifrat, nə də təfritə yol verməməlidir. Kamillik yolunda düşmən təkcə nəfs deyildir. Bə'ziləri nəfsi yeganə düşmən bilib bütün güclərini ona qarşı səfərbər edirlər. Onlar unudurlar ki, ağına-bozuna baxmadan nəfsin ağzından vurmaq insan psixologiyasında .elə fəsadlar yarada bilər ki, vacib əməllər də əldən çıxar

Həzrət İsa (ə) öz şagirdlərinə buyurur: «Nə qədər ki, meyl və şəhvətinizə «yox» deməmisiniz ilahi məqama çata bilməyəcəksiniz».

## ÇƏTİNLİKLƏR QARŞISINDA SƏBR

İnsan dünya həyatında istər-istəməz çətinliklərlə qarşılaşır. Bu çətinliklərlə mübarizə aparmaq bə'zən vacib dini vəzifə olur. Məsələn, xəstəliklə mübarizə aparmaq dini vəzifədir. Həzrət İsa (ə) öz həvarilərinə buyurur: «Ali məqama çatmaq istəyirsinizsə, xoşagəlməz işlərə səbr etməlisiniz».

Çətinliklər irili-xırdalı olur. Adi soyuqdəymədən xərçəng xəstəliyinədək, yüngül əxlaqlı qadından şikəst övladadək bu silsilə uzanır. Əsas məsələ bu çətinliklərlə mübarizədir. Öz işində yalnız Allahın razılığını istəyənlər öz vəzifəsinə əməl edərək dözüm göstərir.

Maraqlı bir dastanda deyilir ki, Xərəqan vilayətində Şeyx Əbül-Həsən Xərəqani adlı arif yaşayarmış. Onun şöhrəti yaxın və uzaq ətrafa yayılıbmış. Bir gün həqiqət axtarışında olan bir şəxs nəsihət almaq üçün şeyxin görüşünə gəlir. Şeyxin arvadı qapıya çıxıb yolçunun istəyini soruşur. Öz ziyarət qəsdini açıqlayan şəxs qadının təhqirlərinə mə'ruz qalır. Qadın hətta öz əri haqqında nalayiq sözlər işlədir. Yolçunun əl çəkmədiyini görüb şeyxin səhraya çır-çırpı yığmağa getdiyini deyir. Yolçu deyilən istiqamətdə yola çıxıb, bir müddət sonra şeyxin çır-çırpı ilə qayıtdığını görür. Şeyx Xərqani ilə görüş həyəcanı yolçunun bədənini lərzəyə salır. Amma şeyxə yaxınlaşdıqca onu dəhşət bürüyür, az qala gözləri hədəqəsindən çıxsın. Şeyxin topladığı çır-çırpını belində gətirən vəhşi şir yolçuya yuxu kimi görünür. Nəhayət, şeyx yerində donub qalmış yolçuya yetişir. Yolçu

dodaqları əsə-əsə soruşur: «Ya şeyx, bütün gördüklərim məni heyrətə gətirir. Amma bir şeyə daha çox təəccüb edirəm: belə bir kəramət sahibi rəzil bir qadınla necə yaşayır?». Şeyx Xərqani gözlərini yerə dikmiş halda buyurur: «Allahın mənə əta etdiyi ...kəramətin səbəbi bu qadın qarşısında göstərdiyim səbrdir».

Əhvalatdan göründüyü kimi, insan Allahın razılığını qazanmaq üçün dünya çətinliklərinə səbr etməlidir.

Nəfslə mübarizənin digər bir forması haram işlərdən çəkinməkdir. İnsan heç bir əzab-əziyyət çəkmədən göz vasitəsi ilə günaha bata bilər. Təbiətin, ulduzlu səmaların, canlı aləmin, ailə-övladın tamaşasından insan böyük zövq alır. Amma insan oturduğu yerdə gözündən şeytan toruna düşə bilər. İcazə verilməmiş səhnələrə baxmaqla insan nəinki axirət hədəflərindən uzaq düşür, hətta bə'zi dünya ləzzətlərindən də məhrum olur.

Gözünə yiyə dura bilən adam şəhvətin acı nəticələrindən qorunur, təkamül yolunu davam etdirə bilir. Amma gözünü nəfsin tabeçiliyinə vermiş insan heyvan kimi zəlalətə düçar olur.

## TƏLƏSİK MÜHAKİMƏLƏRDƏN ÇƏKİNMƏ

Bir çox insanlar yalnız zahiri müşahidə aparmaqla mühakimə yürüdür, kiminin pis, kimininsə yaxşı adamı olması haqqında tələsik qərar çıxarırlar. Bu iş təkcə mö'minə yox, özünü ağıllı hesab edən heç bir fərdə yaraşmaz. Zahir həmişə aldadıcıdır. Zahirən xoşagəlməz bir işə görə insanı pis hesab etmək olmaz. Əslində çox yaxşı bir iş zahirən pis də görünə bilər. Həzrət İsa (ə) bu böyük bəlaya işarə ilə buyurur: «Xoş o insanın halına ki, gözü ilə deyil, qəlbi ilə görür». Heyvanlar da adi gözlə

.görürlər. Amma insanda onun düşüncəsi ilə bağlı olan bəsirət gözü də vardır

İnsan zahiri gözlə görüb yalnız hiss üzvlərinə əsaslanaraq mühakimə yürütməkdən çəkinməlidir. Ağlını işə salıb dərin araşdırmalar aparmaqla şeytanın tələsindən qurtulmaq olar. İnsan bir baxışa görə əbədi bədbəxt ola bilər. Unutmaq olmaz ki, İslama arxadan zərbə vurmaq istəyənlər həmişə üzlərinə mö'minlik maskası taxmışlar. Demək, zahir əsas deyil. Əksinə, zahirən mö'min qiyafəsində olmayan bir .şəxs daxilən əsl mö'min ola bilər

## EYİB AXTARMAQ BƏLASI

İnsanın öz eyiblərinə diqqətli olması birinci dərəcəli vəzifələrdəndir. Təəssüf ki, insanların əksəriyyəti davamlı şəkildə başqalarında eyib axtarırlar. Bu xasiyyətin səbəbi insanın eqoistliyidir. Özünü sevən insan özündə eyib görmək istəmir. Çoxları öz eyiblərindən xəbərdar olsalar da bunu inadkarlıqla gizlətməyə çalışırlar. «Doğrusu, insan özü-özünə şahiddir»(١). Onlar öz eyiblərinin əhəmiyyətini az göstərmək üçün .daha çox eybi olanları misal çəkirlər

Allaha yaxınlaşmaq istəyən insan başqalarının yox, öz şəxsi eyiblərinin qayğısına qalmalıdır. Əslində öz eyibləri ilə məşğul olan insanın başqalarının eyiblərini düşünməyə vaxtı qalmır. Öz gözündə tiri qoyub, başqasının gözündə çöp axtaranlar özlərini eyib axtarmaqda ixtiyar sahibi bilirlər. Həzrət İsa (ə) buyurur: «İnsan bu ruhiyədən çəkinməklə kifayətlənməməli, özünü ağasının cəzasından qorumaq istəyən qul kimi



---

.Qiyamət» surəsi, ayə ١۴» [۶٩] -١

təvazö göstərib çalışmalıdır. Allahı tanımaq üçün insan özünü tanımalıdır. İnsan öz eyiblərini kəşf etmədən çətin ki, özünü tanısın. İnsan nəinki öz eyiblərini kəşf etməli, hətta bu işdə başqalarından kömək istəməlidir. Təkamül yolunu seçənlər əxlaq ustadlarına müraciət edərək öz eyibləri haqqında eşitmək istəmişlər. Bir insana səmimi şəkildə eyibləri deyilərkən qəzəblənib narahat olursa, demək bu şəxsin özünü tərbiyə etmək fikri yoxdur. Avtomobili yolda xarab olmuş sürücü yoldan ötənlərdən kömək istəyir. Maşının eyibi tapılıb sahibinin nəzərinə çatdırılanda o, təşəkkür edir. Eyibli mə'nəviyyatla təkamül yolunu başa vurmaq olarmı? Bir insan eyibini bilmək .istəmirsə, demək onun yola çıxmaq fikri yoxdur

Eyibə münasibətdə daha bir halla rastlaşırıq. Elə adamlar vardır ki, birinin eybini görən zaman özünü üstün tutub hətta qəlbində sevinc də duyur. Beləlıəri yoldan ötən insanın məsələn, libasının söküldüyünü görəndə narahat olmaq əvəzinə, öz səliqəli paltarlarına nəzər salıb qürur duyurlar. Küçədə özündən xəbərsiz sökük paltarla yol gedən adama gülənlər da tapılır. Maraqlı bir rəvayətdə buyurulur: «Bir kafirlə rastlaşdıqda şükr edin ki, Allah sizi imanlı yaradıb». Zahiri eyiblər də belədir. Fiziki cəhətdən nöqsanlı, şikəst adama gülmək yox, özünün belə olmadığın üçün şükr etmək .lazımdır

:Başqalarının ləyaqətsiz hərəkətinə insan bir neçə cür cavab verə bilər

,daha pis rəftar edə bilər –

,eyni şəkildə cavab verə bilər –

,göz yuma bilər –

.pisliyə yaxşılıqla cavab verə bilər –

Pisliyə daha pis şəkildə cavab vermək zülmdür və İslamda bəyənilmir. Xüsusi şəraitlərdə pisliyə cavab vermək olar. Pislik qarşısında göz yummaq və ya pisliyə yaxşılıqla cavab vermək yüksək kamillik sifətlərindəndir. «Mö’minun» surəsinin ۹۶-cı ayəsində buyurulur: «Sən pisliyi yaxşılıqla dəf et». Başqa bir ayədə oxuyuruq: «Yaxşılıqla .(pislik eyni ola bilməz»(۱

Pis rəftara qarşı yaxşı rəftar göstərmək yüksək əxlaqi dəyər olmaqdan əlavə, qarşı tərəfdə də insani hisslər oyadır. İslamda rəftarın müxtəlif dərəcələri vardır. Mənfi və müsbət rəftarların da dərəcələri vardır. Məsələn, pisliyə eyni pisliklə cavab vermək rəftarın sıfır nöqtəsidir. Amma pisliyə yaxşılıqla cavab vermək müsbət rəftarın .zirvəsidir

Bə’ziləri iddia edirlər ki, rəftar ya yaxşıdır, ya da pis. İnsan bir işi vicdanın və ya təbiətinin tələbi ilə görə bilər. Məsələn, alman filosofu Kant iddia edir ki, ananın gecə yarı şirin yuxudan durub körpəsinə süd verməsi əxlaqi



---

.Fussilət» surəsi, ayə ۳۴» [۷۰] -۱

dəyər deyil. O, bu fikrini belə əsaslandırır ki, ana bu işi əqlinin yox, analıq təbiətinin .göstərişi ilə yerinə yetirir

İslamda isə belə deyil. Müxtəlif dərəcəli dəyərlər vardır. Bir əməl sıfırdan sonsuzluqadək dəyərə malik ola bilər. Məsələn, dində ən yüksək ixlas, səmimiyyət həzrət Əliyə (ə) aid edilir. Çünki Həzrət (ə) Allaha cənnətlə cəhənnəmə görə yox, ibadətə layiq olduğu üçün ibadət edirdi. Bir çox əməllərin dəyəri insanın niyyətindən asılıdır. İxlas «qürbətən iləllah» deməkdən yox, ibadəti səmimi qəlbdən icra etməkdən .asılıdır

## MƏ'RİFƏT VƏ ME'YAR

İnsan bir dəfəyə yüksək təkamül mərtəbəsinə çata bilməz. Çünki bu iş nəfsin tərbiyəsi yolu ilə mümkün olur. İslam cəmiyyətində insan onun mərifət və düşüncəsinə uyğun .tərbiyə oluna bilər. Mərifətdən asılı olaraq tərbiyələr də fərqlənir

Hamı bilir ki, Allaha yaxınlıq niyyəti ilə qılınan namaz namazın düzgün formasıdır. Amma bütün müsəlmanlar bu səviyyədə namaz qıla bilərmi? Bu olduqca çətin işdir. Çünki insanlar mə'rifət və agahlıq baxımından müxtəlif səviyyədədirlər. Məsələn, doqquz yaşlı qızdan ixlas gözləmək sadəlövhlük olardı. Uşağı namaza həvəsləndirmək üçün onu başqalarının yanında tə'rifləmək də olar. Belə bir iş uşağın niyyətinə pis .tə'sir göstərsə də başqa çıxış yolu yoxdur. Uşağın vaxtında namaz qılması kifayətdir

Kantın fikrincə, əxlaqi hərəkət yalnız əql və vicdanın hökmü ilə gerçəkləşir. Əgər əməllərimizi Kantın süzgəcindən keçirsək çox cüz'i hərəkətin belə bir xarakterdə olduğunu müşahidə edərik. Amma İslamda əxlaqi hərəkətlərin xarakter müxtəlifliyi göz

qabağındadır. Kantın fikrincə, insan yalnız vicdanın hökmü ilə cihada gedə bilər. Amma İslamda cəhad dini bir vəzifədir və ibadət hesab olunur. Əslində cihada gedənin məqsədi Allahın razılığını qazanmaq olmalıdır. Bəs əslində necədir? «Fəth» surəsinin ۲۰-ci ayəsində buyurulur: «Allah sizə çox-çox qənimətlər və'd etmişdir». Ayədən həvəslənərək qazanc dalınca cihada gedənlər də az olmayıb. Bu hərəkətdə me'yar maddiyyatdır. Biz uşağı namaza həvəsləndirmək üçün ona oyuncaq və'd edirik. Dünyanın əksər cəmiyyətlərini uşaq xasiyyətli böyüklər təşkil edir. Bu insanları şirin və'dlərlə doğru yola çəkməkdən savayı çıxış yolu yoxdur. Əlbəttə ki, insanı kamillik məqamında görmək istəyən Allah insandan əql və vicdandan doğmuş ali niyyətlər tələb edə bilərdi. Görəsən, bəşəriyyətin neçə hissəsi bu tələbə cavab verərdi? Amma Allahın mərhəməti genişdir. Bu mərhəmət bütün bəşəriyyəti əhatə edir.

Əlbəttə ki, tamah məqsədi ilə cihada gedənlər qınanır; «Siz puç dünya malını istəyirsiniz. Allah isə axirəti qazanmağınızı istəyir»(۱). Ən böyük niyyət olan axirət fikrinin də mərtəbələri vardır: əzab qorxusu, behişt ne'mətləri, Allahla görüş. Allahı razı salmaq, Onunla görüş agah və imanlı insanların zövqüdür. Bəs bu zövqdən məhrum olanlar kimə sığınmalıdırlar? Əgər bir insan cəhənnəm əzabının qorxusundan həqiqətə qul olub, hətta canından keçirsə bunun nəyi pisdir?!

Beləcə, İslam dini insanlarla onların səviyyəsinə uyğun rəftar edir. Allah tərbiyəni yalnız Səlman və Əbuzər üçün qərar verməyib. Hər kəs İslam tərbiyəsindən öz mə'rifətinə uyğun bəhrələnməlidir.



---

۱- [۷۱] «Ənfal» surəsi, ayə ۶۷.

## QARAQABAQLARLA MEHRİBANLIQ

Acıdil, ədəbsiz, daşürək, qaraqabaq adamlarla rəftarın müxtəlif mərtəbələri vardır. Ən yaxşı rəftar ehsandır. Belə adamlarla yaxşı rəftar etmək insanı onların şərindən qoruyur, bə᾽zən isə onları dosta çevirir. «Fussilət» surəsinin ٣۴-cü ayəsində buyurulur: «Sən pisliyi yaxşılıqla dəf et. Belə olduqda aranızda düşmənçilik olan şəxsi yaxın bir dost kimi də görə bilərsən.» Xoş rəftar insanın bütün işlərinə ilahi rəng verir. Allahın razılığını qazanmaqdan böyük iş təsəvvür olunmur. İslam insanın belə ali mə᾽rifət .məqamına çatmasını istəyir

İmam Sadiq (ə) İbn Cündəbə buyurur: «Səninlə əlaqəni kəsmiş qohum-əqraba, qonum-qonşu ilə əlaqələri möhkəmləndir və onlar kimi hərəkət etmə. Ehtiyaclı olduğun zaman səndən üz döndərən şəxs çətinliyə düşərsə ona kömək əlini uzat. Pis rəftara yaxşı rəftarınla cavab ver. Səni acıqlayana da ehtiram göstər. Namərdiliyə mərdliklə cavab ver. Zülmü görməməzliyə vur. Heç istəyirsinizmi ki, Allah sizi .«!?bağışlasın? Məgər bağışlanmaq istəyən şəxs başqalarını bağışlamaz

Nur» surəsinin ٢٢-ci ayəsində buyurulur: «Əgər Allahdan bağışlanmaq istəyirlərsə,» .«onları əfv edib bağışlasınlar

Rəvayətlərdə bildirilir ki, başqalarını bağışlayanların günahı qiyamət günü bağışlanar və Allah onların hesabını yüngül edir. Amma alverdə qəpiyindən keçməyənlərin hesabı .da ağır olar

## BAĞIŞLAMANIN DƏYƏRİ

Ayə və rəvayətlərdə çox tə᾽kid olunmuş məsələlərdən biri bağışlamaqdır. :Bağışlayanlar haqqında buyurulur

O müttəqilər ki, bolluqda da qıtlıqda da xərcləyər, qəzəblərini udar, insanların»
.(günahlarından keçərlər. Allah yaxşılıq edənləri sevər»(۱)

Sual oluna bilər ki, bağışlamağın dəyəri mütləqdir, yoxsa nisbi? Başqa sözlə, bütün ?şəraitlərdə bağışlamaq yaxşıdırmı

Zalımın əlindən qaçıb bizə pənah gətirmiş adamı həmin zalıma təhvil vermək olarmı? Məzlumu zalımın əlindən almaq vacib dini vəzifədir. Bəs nə edək? Qapımızı döyən quldura «burada deyil», «görməmişik» desək yalan olmazmı? Sözsüz ki, zülmün qarşısını .almaq üçün yalan danışmağa dəyər

Bağışlamaq üçün də müxtəlif şəraitlər vardır. Əgər zalımı bağışlamaq onun zülmünü artıracaqsa bağışlamaq olmaz. Məsələn, şərikli maldan oğurluq olur. Şəriklərdən biri oğrunu bağışlayarsa, o biri şərikin hüququnu pozar. Bir sözlə, bağışlamağın nəticəsi .zülm yox, savab və hidayət olmalıdır

Bağışlamaq istəyən şəxs cəmiyyəti də düşünməlidir. Peşəkar cinayətkarı bağışlamaq cəmiyyəti təhlükəyə atmaqdır. İslam dini çox dəyərli olan bir qanunla bə’zən .cinayətkarı cəmiyyətin gözü qarşısında cəzalandırır ki, başqalarına da ibrət olsun

On ikinci imam həzrət Mehdi (ə) zühur edən zaman cinayətkarlıq öz kuliminasiya nöqtəsində olacaq. Həzrət (ə) o qədər cani qanı axıdacaq ki, nadanlar onun Fatimə (ə) balası olduğuna şəkk edəcəklər. Amma həqiqi ədalətli cəmiyyəti qurmaq üçün islahedilməz cinayətkarlar öz

səh:۱۷۴

---

.Ali-imran» surəsi, ayə ۱۳۴» [۷۲] -۱

.(cəzasına çatmalıdır: «Ey ağıl sahibləri, bu qisas sizin üçün həyat deməkdir»(۱

Cəmiyyət ilahi qanunların icrası ilə dirçəlir. «Allahın hökmlərindən kənara çıxanlar sözsüz ki, özlərinə zülm edənlərdir»(۲). Rəvayətdə buyurulur ki, bir günaha görə şər'i cəzalandırma cəmiyyət üçün bərəkətli yağışdan daha fadalıdır. Xalqın xəzinəsinə təcavüz etmiş insanı heç vəchlə bağışlamaq olmaz. Xalqın namusuna təcavüz edənlər .üçün xüsusi cəzalar nəzərdə tutulur və tapşırılır ki, belələrinə ürəyiniz yumşalmasın

İmam Sadiq (ə) buyurur: «Öz bağışlanmağınızı sevdiyiniz kimi sizə zülm edənləri də .«bağışlayın

.Qeyd olundu ki, insan başqasının haqqını yox, öz haqqını bağışlaya bilər

Başqa bir mühüm nöqtə «həqqullah» (Allahın haqqları) və «həqqunnas» (insanların haqqları) məsələləridir. Yə'ni oğru dükan sahibindən halallıq alıb onun tərəfindən bağışlanırsa bu hələ o demək deyil ki, Allah da bu adamı bağışlayıb. Allah bəndəni .tövbə etdiyi halda bağışlayır

Həzrət (ə) buyurur: «Allahın sifətlərindən biri budur ki, həm pis, həm də yaxşını bağışlayır». Bəndə öz Allahından nümunə götürməlidir. Amma ilahi sifətləri özündə cilvələndirmək daxilən böyük insanların şə'nindədir. Günəşə bax! O həm yaxşını, həm !də pisi isidir



---

.Bəqərə» surəsi, ayə ۱۷۹» [۷۳] -۱

.Bəqərə» surəsi, ayə ۲۲۹» [۷۴] -۲

İslam dinində əməli dəyərli edən niyyətdir. Həm şiə, həm də sünnü mənbələrində həzrət Peyğəmbərdən (s) belə bir hədis nəql olunur: «Əməllərin dəyəri niyyətdən asılıdır və hər kəs niyyətinə görə bəhrələnəcək»(١). Niyyəti dilə gətirmək zəruri deyil. Niyyət hər hansı bir işi görərkən insanın əsas məqsədidir. İnsan müxtəlif niyyətlərlə işə başlaya bilər: Allahın razılığını qazanmaq, cəhənnəm əzabından qurtulmaq, behişt ne'mətlərinə çatmaq və s. Rəvayətdən belə görünür ki, qeyri-ilahi işə görə axirət mükafatı yoxdur. Məsələn, yol kənarına düşmüş dəmir parçasını istifadə etmək niyyəti ilə götürən şəxs üçün heç bir axirət muzdu yoxdur. Amma bu dəmir parçasını başqalarının ayağına ilişməsin deyə onu götürməklə Allahı razı salmaq istəyən insan üçün ilahi mükafat nəzərdə tutulur. Xalqın gözündə şöhrətlənmək üçün bütün var-dövlətini kasıblara paylayan milyonçu Allahdan mükafat gözləməkdə haqlı deyil. Amma Allahı razı salmaq xatirinə tabağının son çörəyini ehtiyaclı qonşusu ilə bölən şəxs əbədi behişt ne'mətləri ilə mükafatlandırılacaqdır.

İslami əxlaq fəlsəfəsinə əsasən, Allaha görə görülməyən iş sıfıra, dünyəvi məqsədlərlə yerinə yetirilən ibadətlər isə sıfırdan da aşağı, mənfiyə bərabərdir.

İslami düşüncə tərzində olmayanlar belə bir tənasübü qəbul etmirlər. Onlar iddia edirlər ki, hansı niyyətlə olursa-olsun kasıblara pul paylayan şəxs üçün axirət mükafatı vardır. Maraqlıdır, bir şəxsə prezident olmaq



---

١- [٧٥] «Biharul-ənvar», cild ٧٠.

üçün xalqın səsi lazımdır. O, xalqa pul paylayaraq onların səsini alır və prezident olur. Demək, bu şəxs verdiyinin əvəzini alır. Bəs bu adam hansı əsasla Allahdan mükafat uma bilər. İslamda yalnız insan mə’nəviyyatı üçün xeyirli olan işlər məqbul hesab olunur. Axirətdə bu ruhiyyə ne’mətlərlə yüksəldilir. İnsanın Allahla rabitəsinin nəticəsi həmin yüksək əhval-ruhiyyədir. Həzrət Peyğəmbərin (s) buyuruğuna görə, insan Allahı zikr etməklə özü üçün behişt ne’mətlərini artırır. Əksinə, məsələn, bir insan yetimin malını yedikcə özü üçün cəhənnəm odunu alovlandırır: «Həqiqətən yetimlərin mallarını haqsızlıqla yeyənləri yedikləri onların qarınlarında oda çevriləcək və onlar alovlu cəhənnəmə girəcəklər»(۱).

İbadət zamanı insanın qəlbinə qeyri-ilahi fikirlərin nüfuzu da müxtəlif olur. Məsələn, camaatın diqqətini cəlb etmək üçün namaz qılan şəxsə bir çoxları heç əhəmiyyət vermir. Amma mədrəsə, xəstəxana tikib yol çəkən adama hamı hörmətlə yanaşır. Cəmiyyətdə, adətən, namazqılana yox, xeyriyyə işi görənə maraq daha çox olur. Hər iki niyyət qeyri-ilahi olsa da əhəmiyyətli şəkildə fərqlənir.

## RİYA İNFAQIN BƏLASIDIR

İslam dinində ehtiyaclıya göstərilən yardım «infaq» adlanır. İnfaq edən şəxs Allahın razılığından əlavə, ətrafdakıların nəzərini də güdə bilər. Əgər o yardım əlini uzadarkən başqalarının bu işdən xəbər tutmasını istəyirsə niyyəti Allahın razılığını qazanmaq yox, özünü



---

۱- [۷۶] «Nisa» surəsi, ayə ۱۰.

.cəmiyyətə tanıtdırmaqdır. İnsanın bu sayaq ikili niyyəti riya, insan özü isə riyakardır

İnfaq edən şəxs bu işi gizli görməlidir ki, kömək göstərdiyi insan utanıb-sıxılmasın. Gizli infaqın savabı da böyükdür. Ümumiyyətlə, düzgün icra olunmuş çox kiçik bir ibadətin böyük savabı ola bilər. Özü-özündə fiziki işin heç bir dəyəri yoxdur. İşi gözəlləşdirən iş görənin niyyətidir. «Rum» surəsinin ۳۸-ci ayəsində buyurulur: «Yaxın qohuma, yoxsula, miskinə, müsafirə haqqını ver. Allah rizasını diləyənlər üçün bu daha xeyirlidir». «Bəqərə» surəsinin ۲۰۷-ci ayəsində isə belə buyurulur: «İnsanların eləsi də vardır ki, .«Allahın razılığını qazanmaq yolunda öz canını fəda edir

İnsan öz xeyir əməlinin savabını qorumalıdır. Od zəmini yandırdığı kimi günah da savabı yandırır. «Ey iman gətirənlər! Sədəqələrinizi, malını riyakarlıqla sərf edən, Allaha .(və axirət gününə inanmayan şəxs kimi minnət qoymaqla puça çıxarmayın»(۱

Qur'ani-Kərim insanı namazdan daha çox infaqda xalis, səmimi olmağa çağırır. Riya namazı batil edir. Amma infaqda riya ilə daha çox qarşılaşırıq. İmam Sadiq (ə) buyurur: «Xalqın gözü qarşısında infaq etmə ki, səni tə'rifləsinlər. Əgər belə etmisənsə sənin infaqının mükafatı camaatın tə'rifi olacaq. Elə et ki, sağ əlinin infaqından sol əlin xəbərsiz olsun. Gizli sədəqənin mükafatını qiyamət günü hamının gözü qarşısında .«alacaqsan

Əlbəttə, insan riya qorxusu ilə sədəqəni tərk etməməlidir. Özünü kamilləşdirmək istəyən bə'zi mö'minlərə şeytan «baxanlar deyəcək özünü göstərir, vermə!» pıçıldaya bilər. İnsan bu vəsvəsələrin qabağını



---

.Bəqərə» surəsi, ayə ۲۶۴» [۷۷] -۱

alaraq daha qiymətli şeyi infaq edə bilər. Məsələn, insan yol kənarında oturmuş dilənçiyə beş yüz manat sədəqə vermək istəyir. Ətrafda baxanlar da bilir ki, bundan çox sədəqə verən yoxdur. İnsan riyadan qorunmaq üçün ovcundan beş yüz manat yox, min manat tutub onu elə gizli verə bilər ki, kimsə min manat verdiyini hiss etməz. Bundan əlavə, insan nəfsi ilə mübarizə aparıb çox sevdiyi əşyaları hədiyyə etməklə böyük savab qazana bilər. Amma belə də ola bilər ki, insanın öz nəfsinə hakim olması şərti ilə açıq işin böyük savabı olsun. Çünki bə'zən açıq xeyirxahlıq başqalarında da belə bir həvəs oyadır. «Mallarını gecə və gündüz, gizli və aşkar sərf edənlərin Allah yanında böyük mükafatları vardır»(١).

Açıq əməl bə'zən şübhələri də aradan qaldırır. Bir müsəlman xüms və zəkatı gizli ödəyərsə onun dini vacibata əməl etməməsi barədə şübhələr yarana bilər.

## İNSANIN RƏFTARINDA DÜZGÜN BAXIŞIN ROLU

İnsanın dünyagörüşü onun fəaliyyətinə istiqamət verir. Varlıq aləmi haqqında yanlış fikirdə olan insan şübhələr, tərəddüdlər səbəbindən öz insanlıq vəzifələrinə süst yanaşır. Həyatı boyu suallarla qarşılaşan insan ən azı haradan gəldiyini və haraya gedəcəyini bilməlidir. Bu suallara cavab tapmadan doğru təkamül yolunu tapmaq qeyri-mümkündür.

Son əsrlərdə xüsusi ilə Avropada insanların dini e'tiqadı zəiflədiyindən əxlaqi dəyərlərə də münasibət dəyişmişdir. Elmi-texniki tərəqqinin tə'siri altında yalnız təcrübədən keçənləri həqiqət hesab edən Avropa «Allah»,



---

١- [٧٨] «Bəqərə» surəsi, ayə ٢٧٤.

vəhy», «qiyamət» kimi anlayışları inkar etməkdən çəkinmir. Din ehtimal yox, yəqinlik» tələb etdiyindən bu günkü avropasayağı düşüncə tərzi tamamilə həqiqətdən uzaqdır. Ümumiyyətlə, qərb ölkələrində e'tiqad zəifliyinin səbəblərindən biri orada materialist .dünya görüşünün daha çox təbliğidir

Dinin və əxlaqın ayaq altına atıldığı bu cəmiyyətlərdə «sekularizm» adlanan baxış yayılmaqdadır. Sekularizm bütün dini e'tiqadları ictimai həyatdan sıxışdırıb çıxarmaq əzmindədir. Dünyada əxlaqsızlıq baş alıb gedir. İstisnasız olaraq bütün filosoflar sekularizmin təqdim etdiyi «azad əxlaq»ı əsl əxlaqsızlıq hesab edirlər. Dini dəyərləri itirmiş cəmiyyətin əxlaqı iyrənc kübar əxlaqından başqa bir şey deyildir. Aydın məsələdir ki, ilahi dəyərlərlə nizamlanmayan əxlaq məzhəkəçilikdir. Belə cəmiyyətlərdə hər sosial təbəqənin öz əxlaqı olur. Kişilərin qadınlıq etməsinin, qadınların nikahsız yaşamasının əxlaqsızlıq olduğunu sübut etmək üçün ilahi göstəriş lazımdır. Sekularizm isə dinə yer vermədiyindən hər məhəllənin özünəməxsus etiketi .yaranır

Möhkəm əsaslara malik dini dəyərlərin möcud olmadığı bir cəmiyyətdə insan özü öz taleyi haqqında düşünməlidir. İnsan tövhid, nübüvvət və məad kimi əsas e'tiqadları .dərk etməyə müvəffəq olarsa bu onun dünyagörüşü və rəftarına öz tə'sirini göstərər

## AXİRƏT İNANCININ HƏYAT TƏRZİNƏ TƏ'SİRİ

İslam dininin əsaslarından biri axirət inancıdır. Peyğəmbər tə'limlərinin ruhunu təşkil edən bu inanc

haqqında ayə və rəvayətlər çoxdur. Bir çox ayələrdə dünya və axirət həyatı müqayisə .olunur

Məada ... ölümdən sonra həyatın varlığına iki baxış mövcuddur; bə’ziləri iddia edirlər ki, .ölüm sondur, ikinci baxış isə ölümdən sonra əbədi həyatın varlığına dəlillər gətirir

Dini dünyagörüşün, yə’ni dindarlığın əsaslarından biri ölümdən sonrakı həyatın varlığına inanmaqdır. Hətta peyğəmbərliyə inanmayan bə’zi dinlər də ölümdən sonrakı həyatı qəbul edir. Arxeoloji qazıntılardan alınmış nəticələr sübut edir ki, min illər əvvəl yaşamış insanlarda axirət inancı olub. Onların qəbirlərində axirətdə istifadə etmələri üçün qoyulmuş əşyalar tapılıb. Dini fəlsəfə insanı inandırır ki, yaşadığımız dünya əsl əbədi həyat üçün bir müqəddimədir. Dünya həyatı körpənin ana bətnində keçirdiyi həyata bənzəyir. Bu körpə elə bağlı bir mühitdədir ki, xaricdə daha geniş bir .dünyanın olduğunu hiss edə bilməz

Qur’an insanı öyrədir ki, bir mövzuya diqqətli olmaq üçün ona təkrar-təkrar qayıtmaq lazımdır. Namazda ilahi ayələrin təkrarlanması bu deyilənə bir sübutdur. Uyğun olaraq Qur’an insana axirət mövzusunu təkrar-təkrar xatırladır. «Ənkəbut» surəsinin ۶۴-cü ayəsində buyurulur: «Bu dünya həyatı əyləncədən başqa bir şey deyildir. Axirət yurdu isə şübhəsiz ki, əbədi həyatdır». Başqa bir yerdə buyurulur: «O gün vay halına (axirəti) .(yalan sayanların»(۱

səh:۱۸۲

---

.Mursəlat» surəsi, ayə ۲۴» [۷۹] -۱

Hud» surəsinin ١٠۶-cı ayəsində buyurulur: «Bədbəxt olanlar od içərisində qalacaqlar.» Onları orada ah-fəryad gözləyir». ١٠٨-ci ayədə isə belə deyilir: «Xoşbəxt olanlar isə Rəbbinin dilədiyindən əlavə tükənməz bir ne'mət kimi göylər və yer durduqca .«cənnətdə əbədi qalacaqlar

İstisnasız olaraq bütün insanlar xoşbəxtlik haqqında düşünür və buna can atır. Bu mövzu filosofların daimi mübahisə predmetidir. Hamı düşünür: dünyada necə xoşbəxt olmaq mümkündür? Amma Qur'ani-Kərim buyurur ki, əsl xoşbəxtlik behişt, əsl .bədbəxtlik isə cəhənnəmdədir

Din dünya ləzzətlərini inkar etmir, amma xatırladır ki, bu ləzzətlər imtahan üçündür: .(«Bilin ki, mal-dövlətiniz və övladlarınız sizin üçün ancaq bir imtahandır»(١

Bə'ziləri də elə hesab edirlər ki, xoşbəxtlik Allahın sevimlisi olmaqdır və yalnız Allahın qəzəbinə düçar olanlar dünya ne'mətlərindən məhrum edilir. Qur'an isə belə buyurur .ki, həm dünya xoşbəxtliyi, həm də məhrumiyyət sadəcə bir imtahandır

İnsan qazanca sevinib, itkidən ötəri mə'yus olmamalıdır. «Hədid» surəsinin ٢٣-cü ayəsində buyurulur: «Bu, əlinizdən çıxana kədərlənməyiniz üçündür. Allah özünü .«bəyənib, özü ilə fəxr edən heç bir kəsi sevməz

Bütün peyğəmbərlər və ilahi kitablar həqiqi həyatın bu dünyada yox, axirətdə «olduğunu bildirmişlər. «Ə'la



---

.Ənfal» surəsi, ayə ٢٨» [٨٠] -١

surəsinin ۱۴-۱۵-ci ayəsində buyurulur: «Günahdan təmizlənən kimsə nicat tapacaq. O kimsə ki, Allahın adını zikr edib namaz qılar. Lakin siz dünyanı üstün tutursunuz. Hansı ki, axirət daha xeyirli və əbədidir». Sözsüz ki, dünya, axirətlə müqayisə edilə bilməz. Yalnız dünyanı ötəri, müvəqqəti qəbul edən insanda düzgün dünya görüşü formalaşa bilər.

Dünyanın bütün xeyir və şərləri nisbidir. «Adiyat» surəsinin ۸-ci ayəsində oxuyuruq: «Həqiqətən insan var-dövlətə çox hərisdir». «Bəqərə» surəsində isə belə deyilir: «Hər birinizi ölüm haqlayan zaman qoyub gedəcəyiniz maldan valideyinlərinizə və yaxınlarınıza verilməsi üçün ədalət üzrə vəsiyyət etməyiniz zəruridir»(۱). Bəli, dünya malında xeyir də var. Amma bu malın halal olması əsas şərtdir.

Hələ ki, axirəti görməmiş insan müvəqqəti dünyanı da həyat hesab edə bilər. Axirət dünyasını gördükdən sonra isə dünya həyatının həqiqəti hamı üçün aydın olur. Rəvayətlərdə tapşırılır ki, namazda «Ə'la» surəsini oxuyun. Çünki bu surədə dünya və axirət haqqında aydın biliklər verilmişdir. Bu surəni diqqətlə oxuyan insan ondakı mə'naların tə'sirindən heç vəchlə qəflətdə qala bilməz. «Axirət daha yaxşı və daha davamlıdır»(۲). İnsan bu ayəni təkrar zehnindən keçirməli, böyük xeyir əməllər üçün şərait hazırlamalıdır. İmam Sadiq (ə) Əbdullah ibn Cündəbə buyurur: «Bütün yaxşılıqlar qarşıda və bütün pisliklər gələcəkdədir. Yaxşılıq və pisliyi yalnız axirətdə görə biləcəksən». Həzrət (ə) demək istəyir ki, bu dünyadakı yaxşılıqlar və pisliklər nisbidir,



---

۱- [۸۱] «Bəqərə» surəsi, ayə ۱۸۰.

۲- [۸۲] «Ə'la» surəsi, ۱۷.

əsl xeyir və şər isə axirətə aiddir. Dünyanın istər yaxşılığı, istərsə də pisliyi olduqca zəifdir. İnsan nəyə çatırsa qane olmur. Çünki onun ruhu davamlı ne’mətlər sorağındadır. Dünya ne’məti ilə insanı doyurmaq istəyi, südəmər körpəni adi su ilə doyurmaq istəyi kimidir. Əgər insan ruhu davamlı ne’mətlər sorağındadırsa onu dünyanın davamsız ne’mətləri ilə aldatmaq olarmı? Qur’ani-Kərimdə Adəm və Həvvanın aldadılması səhnəsini oxuduqda şeytanın insandakı əbədilik meylindən istifadə etdiyini görürük. «Taha» surəsinin ١٢٠-ci ayəsində oxuyuruq: «Əbədiyyət ağacı və əbədi mülk istəyirsənmi?». İmam Sadiq (ə) buyurur: «Həqiqi xeyir və həqiqi şər .«behişt və cəhənnəmdədir

Gəlin dünyanın xeyrindən axirət səadətimiz üçün istifadə edək və təkamülümüzə .mane olacaq dünya şərindən uzaq olaq

### İLAHİ NE’MƏTLƏR HAQQINDA DÜŞÜNCƏ

İnsan əlaqi dəyərlərə xüsusi diqqət göstərdiyi halda özü şəxsən bu dəyərlərə çatmağa tələsmir. O, ilahi əxlaqi göstərişlərə əməl etmək istəsə də iradəsizlikdən dünya işləri ilə ?baş qatır. Bəs bu ali məqama hansı yolla çatmaq olar

Əvvəla qeyd edək ki, hər hansı bir iş üçün qərara gəlməzdən əvvəl müqəddimə, stimul lazımdır. İnsan bir sıra ilkin biliklərə malik olmalıdır ki, iradəsini işə salıb qəti qərara gələ bilsin. İlahi ne’mətlər haqqında mə’lumatlı olmaq çox faydalıdır. Allah bizə hansı ?ne’mətləri verib? Bu ne’mətlər qarşısında vəzifəmiz nədir

Allahın böyük ne’mətlərindən biri iman və doğru məzhəbdir. Məsələn, dünyada əksər insanlar tanrıya inanır və hansısa məzhəbin ardıcıllarıdır. Amma bütün

məzhəblərin doğru olması qeyri-mümkündür. Allah birdir və Onun qayda-qanunlarını doğru əks etdirən məzhəb də bir olmalıdır. Biz Əhli-beyt sevgili müsəlmanların bu sahədə heç bir problemimiz yoxdur. On dörd əsr boyu toxunulmamış vahid kitabımız !və bütün e'tiqadi suallara yetərli cavablarımız var. Bu olduqca böyük ne'mətdir

Allah nəinki dünya həyatında, eləcə də bətn həyatı, hələ ondan da əvvəl ata-anadakı həyatımızda bizə misilsiz ne'mətlər əta etmişdir. Amma hələ qarşıda vəsfə gəlməyən axirət ne'mətləri vardır. Bu dünyada olan insan axirət ne'mətlərinin həqiqətini hələ ki .dərk etməkdə acizdir

Bəs bütün ne'mətlərin fövqündə dayanan axirət ne'mətlərinə necə çatmaq olar? Cavab qısa və aydındır: Allahın müəyyənləşdirdiyi vəzifələrə əməl etməliyik! Bu vəzifələr heç kimin gücündən, imkanlarından xaric deyil. «Allah sizin üçün ağırlıq deyil, yüngüllük istər...» (١). Vəzifələrin yüngül olmasının özü də bir ne'mətdir. Misilsiz axirət ne'mətləri müqabilində daha ağır tələblər də ola bilərdi. Amma Allah-təala həm .vəzifələri yüngül və həm də öz yardımını təklif etmişdir

## NE'MƏTLƏR MÜQABİLİNDƏ VƏZİFƏLƏR

Fitrətən pak olan insanlar ən kiçik yaxşılığı belə unutmur, daim bunun əvəzini çıxmağa çalışırlar. Bəs necə olur ki, kiçik yaxşılığı unutmayan insan Allah-təalanın misilsiz ne'mətlərinə qarşı diqqətsizlik göstərir? Əgər insan bu ne'mətlər haqqında ətraflı ,düşünərsə bir an olsun belə Allahı yaddan çıxarmaz. Əgər insan bilsə ki



---

.Bəqərə» surəsi, ayə ١٨۵» [٨٣] -١

Allahın göstərişləri … namaz, oruc və s. yalnız insanın xoşbəxtliyi, kamilləşməsi üçündür, bütün bu göstərişlərə həvəslə əməl edər. Bu mövzuda yetərincə düşünən .insanın əxlaqi göstərişlərə əməl etməsi üçün şərait yaranır

İmam Sadiq (ə) buyurur ki, Allahın öz həqiqi dinini tanıtdırdığı, hidayət etdiyi, .ne'mətləri tanıması üçün elm və hikmət verdiyi şəxs Allaha şükr etməlidir

İmam Sadiq (ə) üç əxlaqi fəzilətə diqqəti yönəldir. Kamilliyə çatmaq istəyən insan üçün .bu fəzilətlərin müstəsna əhəmiyyəti vardır

.Birinci fəzilət şükr etmə və haqtanıma ruhiyyəsinin qüvvətləndirilməsidir

.İkinci, insan daim Allahı xatırlamalıdır

.Üçüncüsü, insan ne'mət sahibinə müt'i olub günaha yol verməməlidir

Sonra İmam (ə) bu sifətlərə yiyələnməyin yollarını göstərir: «İnsan əta olunmuş ne'mətlər haqqında düşünməlidir; dünyaya gəlməzdən əvvəlki ne'mətlər, dünya ne'mətləri, və'd olunmuş axirət ne'mətləri. Axirət ne'mətlərinə çatmaq üçün ilahi göstərişlərə itaət etmək lazımdır və bu vəzifələr ağır deyil. Bu göstərişlər o qədər sadədir ki, onlara hamı əməl edə bilər. Hətta qarşıya xüsusi çətinliklər çıxdığı zaman bu sadə vəzifələr də insanın öhdəsindən götürülür». Dində sizin üçün heç bir çətinlik yeri (qoymadı.»(١)

Allah ən yüngül vəzifələrin icrasında da insanı tək qoymur. Allah onu köməyə çağıranlara yardım və'd edir. Bununla belə insan naşükürlük edir. «Həqiqətən, insan



---

.Həcc» surəsi, ayə ٧٨» [٨۴] -١

zalım və nankordur»(١). İnsan Allahı unutduracaq səvəyyədə dünya həvəslərinə uymuşdur. Dildə kamilliyə çatmaq istəyini izhar etsə də əməldə dünyaya qatılıb, ilahi .göstərişlərə asilik göstərir



---

.İbrahim» surəsi, ayə ٣۴» [٨۵] -١

İnsan kamillik yolunu keçib həqiqi səadətə çatmaq üçün həm Allah, həm də Allahın bəndələri ilə əlaqəni möhkəmləndirməlidir. Allahla əlaqəni möhkəmləndirməyin ən yaxşı yolu namazdır. Əlbəttə ki, dini vəhyə əməl etmək və kamilliyə çatmaq ayrı-ayrı məsələlərdir. Namaz qılıb oruc tutmaq sadəcə, vəzifəyə əməl etməkdir. Bu əməllərlə əzabdan qutarmaq olar. Amma kamilliyə çatmaq üçün başqa şərtlər vardır. Namaz vasitəsi ilə kamala çatmaq üçün namazda bə'zi incəliklərə əməl etmək lazım gəlir.

İmam Sadiq (ə) qüdsi hədislərin bəyanı ilə namazın bə'zi qəbul şərtlərini açıqlayır. İlkin şərtə görə namaz zamanı Allahın əzəməti unudulmamalıdır. İnsan Allahın əzəmətini daha çox dərk etdikcə öz kiçikliyini daha çox anlayıb daha çox təvazö göstərir.

Allahın əzəmətinin daha yaxşı dərk olunması üçün həzrət Peyğəmbərdən (s) bir rəvayət nəql edirik: Peyğəmbər (s) zamanında ətir satmaqla məşğul olan Zeynəb adlı bir qadın var idi. O, ən yaxşı ətirlərini həzrət Peyğəmbərə (s) satarmış. Bir gün Zeynəb Həzrətdən (s) xahiş etdi ki, ona Allahın əzəmətindən danışsın. Həzrət buyurdu: «Sən Allahın xilqətinin əzəmətini dərk etmədən Onun əzəmətini dərk edə bilməzsən. Bu yer öz dənizləri, dağları, böyük şəhərləri ilə birlikdə birinci səma üçün səhradakı halqa kimidir. Birinci səma ikinci, ikinci səma üçüncü, nəhayət, yeddinci səma Allahın ərşi üçün geniş bir səhradakı halqa mislindədir».

Hal-hazırda astronomlar bizim planetdən milyardlarla işıq ili uzaqda olan planetlər kəşf ediblər. Yəni günəş sistemi hazırkı əzəməti ilə qalaktikada olduqca kiçik bir sistemdir. Bu barədə dərindən düşündükdə Allahın məxluqunun əzəmətindən elə heyran olursan ki, Allahın öz əzəməti qarşısında bir söz tapıb deyə bilmirsən. Bu .əzəmət insanı təvazöyə vadar edir

## İKİNCİ ŞƏRT

Namazın qəbulu üçün insan Allah xatirinə öz nəfsani istəklərindən əl çəkməlidir. O, acizliklə ərz etməlidir ki, Xudaya, səni sevdiyim üçün şəhvət və günah ardınca getmirəm. Namazın qəbulu üçün insan Allah xatirinə nəfs istəklərindən əl çəkməlidir. O, acizliklə ərz etməlidir ki, Xudaya, səni sevdiyim üçün şəhvət və günah ardınca getmirəm. Hansısa dostuna müəyyən istəklərini qurban verən insan Allah xatirinə də nədənsə keçməlidir. Namaz hara, günah hara! İnsan öz namazına diqqətli olduqca çirkin işlərdən uzaqlaşır. «Məryəm» surəsinin ۵۸-ci ayəsində buyurulur: «Onlar Allahın ayələri oxunduğu zaman ağlayaraq səcdəyə qapanırdılar». Növbəti ayədə isə belə buyurulur: «Onlardan sonra namazı tərk edib, şəhvətinə uyan bir nəsil gəldi». Həqiqi .namaz qıla bilməməsinin səbəbi ilə maraqlanan insan öz günahlarına nəzər salmalıdır

## ÜÇÜNCÜ ŞƏRT

Namaz qılan insan gününü Allahı yada salmaqla keçirməlidir. Az da olsa dili daim -Allahın zikrində olan insanlarla rastlaşırıq. «O kəslər ki, nə ticarət, nə alış

.(veriş onları Allahın zikrindən, namazdan və zəkatdan yayındırmaz»(١

Dünya işindən ayrılmadan Allahı zikr etməyin mümkünlüyü haqqında mərhum Əllamə Təbatəbai buyurur: «Əzizini əldən vermiş insan gündəlik işi ilə məşğul ola bilirsə, böyük ilahi insanlar da gündəlik fəaliyyətlərindən ayrılmadan Allah haqqında düşünə bilirlər».

## DİGƏR BİR ŞƏRT

Allah qarşısında təvazö göstərən insan Onun bəndələri ilə təkəbbürlü davranmamalıdır. Əsl abid imkanı daxilində acları doyurmaqla bir növ zəkatını ödəməlidir. Axı zəkat təkcə vacib buyurulmuş zəkat deyil. Allah yolunda verilən hər bir şey zəkat hesab oluna bilər. Bilirik ki, İslamda yalnız qeyd olunmuş şeylərin zəkatı vacibdir. Amma sədəqə, nəfəqə kimi müstəhəb zəkatları da unutmaq olmaz. «Məryəm» surəsinin ٣١-ci ayəsində buyurulur: «(Məryəm deyir) O, harada oluramsa olum məni mübarək etdi və mənə diri olduqca namaz qılıb zəkat verməyi tapşırdı».

Bu və digər ayələrdə namazla zəkatın adı qoşa çəkilir. Demək, bəndələr qarşısında təvazö, onlara yardım namazın qəbul şərtlərindəndir.

Namazın digər bir qəbul şərti çılpaqları geyindirməkdir. İnsanın libasa olan ehtiyacını ödəmək, evsizlərə sığınacaq vermək hər birimizin müsəlmanlıq vəzifəmizdir.



---

.Nur» surəsi, ayə ٣٧» [٨۶] -١

Namazın qəbul şərtlərinə əməl edən insanın çöhrəsi mə’na aləmində günəş tək parlayır. Bəsirət gözlü mö’minlər bu nuru elə bu dünyadaca görə bilərlər. Aramızda bəsirət gözü açıq olan insanlar var ki, bir baxışla insanın günahkar, yoxsa abid olduğunu hiss edirlər. Çünki ibadətin tə’sirindən qəlb və ruhun işıqlanması zəruridir. Allah namazı qəbul olunmuş şəxsin həyatını işıqlandırır. «Hədid» surəsinin ۲۸-ci ayəsində buyurulur: «...Allah sizə öz mərhəmətindən iki pay versin. Sizə (Onun yolu ilə) getməyiniz üçün nur bəxş edib sizi bağışlasın».

Təqvalı insanlar maddi zülmətlərə düşdükdə belə Allah onlara hissi bir nur əta edir. Qur’anı üzündən oxuyan korlar az olmayıblar. Ariflərdən biri nəql edir ki, gecə kor tələbənin hücrəsinə girərkən gördüyüm səhnədən heyrətə düşdüm. Onun gözlərindən əlindəki Qur’ana iki şüa yönəlmişdi!

Bə’zən həyatda elən insanlarla qarşılaşırsan ki, səbr kasanı daşdırır. Belə məqamlarda insanın özünə nəzarət etməsi olduqca çətindir. Amma namazı qəbul olunmuş şəxslərə gözəl səbr əta olunur. Ömrü faydalı olduğundan Allah belə insanları mələklərlə hifz edir. Onun duası qəbul olur. O behişt çiçəkləri kimi həmişə təravətlidir. Onda dini elmlərə olan maraq sabit və ülvidir.

Qur'ani-Kərimdə həya haqqında bir çox buyuruqlar vardır. Həzrət Musanın (ə) və Şüeybin qızlarının əhvalatlarında «istihya» kəlməsi ilə rastlaşırıq. «O iki qadından biri .(həya edə-edə Musanın yanına gəldi...»(١)

Xüsusi ilə xanımlar haqqında bu mövzuda rəvayətlər çoxdur. Bə'zi rəvayətlərdən belə aydın olur ki, «həya» və «iman» bir-biri üçün zərurətdir. Yə'ni imanını itirən insan həyasını da itirər. Hətta buyurulur ki, həyasız insan İslam bağını boynundan çıxarar. Belə rəvayətlər də var ki, Allah bir qövmü günahına görə cəzalandırmaq istəsə o qövmün həyasını əlindən alar. Təəssüf ki, bə'ziləri həya sözünü xəcalət çəkmək kimi başa düşürlər. Onlar iddia edirlər ki, xəcalət çəkən insan özünə inamı itirir və ictimai fəaliyyətdən dala qalır. Məhz buna görə də həya etmək lazım deyil! Bu yanlış təsəvvür İslami göstərişlərə tam ziddir. Həya böyük bir fəzilətdir və onu utancaqlıqla .eyniləşdirmək olmaz

Psixologiyada həya psixoloji bir durum kimi tanınır. Psixoloji xüsusiyyətlərə isə dəqiq tə'rif verib, o hissi keçirməmiş insana tanıtdırmaq olmur. Məsələn, heç zaman təəccüblənməmiş insana təəccübün nə olduğunu anlatmaq qeyri-mümkündür. Həya .da bu qəbildəndir

İmam Sadiq (ə) buyurur: «Allahın yalnız insanlar üçün müəyyənləşdirdiyi və heyvanların məhrum olduğu xüsusiyyət həyadır». Həya çox böyük dəyərləri əhatə edir. Adətən, həyadan məhrum insan heç bir əxlaqi dəyər tanımır. Onlar əhdinə əməl etmir, əmanəti sahibinə



---

.Qəsəs» surəsi, ayə ٢٥» [٨٧] -١

qaytarmır. Yalan danışır, bütün alçaq sifətlərə qucaq açır. İnsanı bir çox əxlaq .qüsurlarından amanda saxlayan həyadır

İnsanda həya iki yolla yarana bilər: eyibsiz olmaq istəyi və eyibləri örtmək arzusu. İnsanın çirkin işindən başqaları xəbər tutur. Yə'ni gizli eyib aşkarlanır. İnsan xəcalət çəkməyə başlayır və narahat olur. İmam Sadiq (ə) buyurur ki, həyanın faydası xəcalət gətirəcək işlərin qarşısının alınmasıdır. İnsan öz eyibinin açılmasını istəmir və daim bu eyibləri gizlətməyə çalışır. Bu xüsusiyyət insanı heyvandan fərqləndirən əsas xüsusiyyətdir. Qur'anda oxuyuruq ki, Adəm və Həvva qadağan olunmuş meyvədən yeyən kimi eyibləri açıldı. Maraqlıdır, eyibin açıqlamasının səbəbi yeyilən meyvənin xüsusiyyəti idi, yoxsa bu meyvəni yeyən öz eyibindən xəbər tuturdu? Hər halda, bu .işdə meyvə tə'sirli olmuşdur

Deməк, eybini gizli saxlamaq insanın fitri istəyidir. İnsanı belə hallarda narahat edən məhz həya hissidir. Övliyaların həyası bütün bəşəriyyət üçün nümunədir. Səlman Farsi .və bir çox başqa övliyalar ömrünün sonunadək öz ayıb yerinə baxmamışdır

Öz eyiblərindən çəkinməyən insan bütün çirkin işlərə gedər. Yalnız eyibsizlik arzusunda olanlar xəcalət çəkir. Nəfsinə hörmət edən insan hər cür nöqsanlardan qaçmalı və nəfsini pak saxlamalıdır. İnsan kamil olmaq istədiyi üçün xəcalət çəkə bilər. .Əgər kamillik, mö'minlik, insanlıq arzusu yoxdursa, həyadan danışmağa dəyməz

**ƏSL HƏYA**

Tutaq ki, adətə görə camaat bir şeyi pis bilir. Əslində isə bu iş eyib deyil və ona görə .xəcalət çəkməməlidir

Məsələn, bir şəxsin gözündə qüsur var və müalicəsi mümkün deyil. Belə bir çatışmazlığa görə xəcalət çəkmək, onu gizlətmək lazım deyil. Çünki bu eybi gizlətməyə çalışan adam bir çox fəzilətlərdən məhrum ola bilər. Ümumiyyətlə, insan ifrat və təfritdən çəkinməlidir. Fiziki qüsuru gizlətmək ifrat hesab olunur və bu işdən çəkinmək .lazımdır

Yaxşı sifətin həm ifrat, həm də təfriti pis sifətdir. Məsələn, cinsi istəyi tə'min etmək üçün evlənmək düzgün yoldur. Amma həm arvadbazlıq, həm də qadından birdəfəlik .imtina pis haldır və günah hesab olunur

Həyanın da ifratı və təfriti ola bilər. Əgər bir şəxs bədənindəki nöqsana görə həya edib cəmiyyətə çıxmırsa, bu ifratdır və həya hesab olunmur. Belə də ola bilər ki, insan öz çirkin işlərindən çəkinməyib bu halı normal hesab edər. Əgər həya insanın səciyyəvi xüsusiyyətidirsə, onu hansı əsasla tərk etmək olar? Həyasız insanın çirkin işlərdən çəkinmə ehtimalı sıfra bərabərdir. Eyibini aradan qaldırmağa gücü çatan insan hökmən bu işə ciddi yanaşmalıdır. Məsələn, cahil, savadsız olmaq eyibdir. Bu eybi aradan qaldırmaq üçün insan elmlə məşğul olmalıdır. Amma bə'ziləri susmaqla öz savadsızlığını gizlətmək istəyir. Hətta bə'zi tələbələr öz hazırsızlığını gizlətmək üçün müəllimə sual verməkdən də çəkinirlər. Hansı ki, belə bir yanaşma insanı uçuruma aparır. Şər'i məsələlərdə də guya, həya etdiyi üçün ehtiyacı olan məsələləri soruşub .öyrənməyənlər çoxdur. Belə bir utancaqlıq insana çox baha başa gələ bilər

Demək, xəcalət çəkməkdə ifrat və təfrit pislənilir. Əsl həya insanı günahdan çəkindirən .həyadır. Yersiz utancaqlıq və sırtıqlıq isə bəyənilməyən sifətlərdir

Əsas suallardan biri budur ki, pis nədir və nədən həya etmək lazımdır? Bu suallara İslam dini son dərəcə dəqiqliklə cavab verir. Dinimizdə böyük və kiçik günahlar, əxlaqa zidd olan bütün çirkin sifətlər ətraflı şəkildə şərh olunmuşdur. İnsan məhz dinin məzəmmət etdiyi işlərə görə xəcalət çəkməlidir. Amma ilk baxışda pis hesab olunan bir işi şəriət bəyənirsə bu işə görə xəcalət çəkməyə dəyməz. Məsələn hicabsızlıq, qadının açıq-saçıq cəmiyyətə çıxması el arasında adi bir iş olsa da dində yol verilməzdir. Hətta bir çox müsəlman cəmiyyətlərində qadınlar İslami hicaba riayət .etməkdən utanırlar. Əslində, bu həya yox, Allahın buyuruğundan çıxmaqdır

Digər bir mühüm nöqtə budur ki, insanın daxilində iki zidd istək mövcud ola bilər. Məsələn, xalqın hörmətini qazanmaq istəyən bir adam İslamın ziddinə hərəkət etməli olar. Bu insan birinci dəfə günah edəndə xəcalət çəkə bilər. Amma bu iş təkrarlandıqca insana elə gəlir ki, bu o qədər də pis iş deyil. Hər gün daxilində gedən mübarizədən qurtulmaq üçün belə insan özü kimi günahkar axtarır ki, heç olmaya ondan xəcalət çəkməsin. Beləcə, cəmiyyətdə günah artmağa başlayır. İslam şərqində hicabı ilk dəfə atanlar xalqın nəzərində ən iffətsiz qadınlar hesab olunurdular. Amma tədricən bu iş cəmiyyətə yayıldı və hicabsızlar yox, hicablılar xəcalət çəkməyə başladı. Belə azğınlar əvvəl hədis, sonra Qur'anı daha sonra isə Allahı inkar etməkdən xəcalət duymadılar. «Rum» surəsinin ۱۰-cu ayəsində buyurulur: «Sonra da Allahın ayələrini yalan hesab edib .«məsxərəyə qoymaqla pislik edənlərin aqibəti daha pis oldu

## HƏYA İLƏ XƏCALƏTİN FƏRQİ

Həya məfhumu xəcalət məfhumundan tamamilə fərqlənir. Xəcalət insanın fəaliyyət dairəsini kiçildir, onun üçün problemlər yaradır. Əsl həya isə eyibli bir iş görən insanın keçirdiyi haldır. Həya yalnız öz şəxsiyyətini qiymətləndirən insanlarda olur. Onlar kiçik .bir nöqsana yol verdikdə öz şəxsiyyətlərini itirməkdən qorxurlar

İkinci bir tərəfdən, həya əxlaqi bir sifət olaraq yaxşını pisdən ayırır. Qeyd etdik ki, ifrat və təfrit pis, e᾿tidal (orta hədd) isə yaxşıdır. Bə᾿zən insan yaxşı bir işi eyib hesab edir. Müəllimə sual vermək istəyən tələbəni nəzərinizdə canlandırın. Onun qəlbi titrəyir, rəngi ağarır. Nə üçün bu hala düşdüyünü soruşsanız, deyər ki, xəcalət çəkirəm. Ona görə də belə bir məsəl məşhurdur: «Bilməmək eyib deyil, soruşmamaq eyibdir». Çoxları .cəmiyyət içərisində qüsurlu görünər deyə danışmır

Hərtərəfli bacarıq üçün məşq və təkrara ehtiyac vardır. İnsan özünə təlqin edə bilər ki, mən kütlə içərisində danışa bilər və sadə danışıq üsulu seçməklə müvəffəq ola bilərəm. Qəti şəkildə deyə bilərik ki, uyğun hallarda xəcalət çəkib susmaq pisdir. Belə ?xəcalət insanı təkmül yolundan saxlayır. Axı sual verməyən tələbə nə öyrənə bilər

İnsan «bilmirəm» deməyi də bacarmalıdır. Əgər bunu bacarmırsa daha böyük nöqsanlara yol verərək yalan danışıb camaatı azdıra bilər. Yersiz xəcalətə görə kütləni .azdıranlar bütün kütlənin günahına şərikdirlər

İmam Sadiq (ə) buyurur: «Sizə verilmiş sualın cavabını bilmirsinizsə, deyin ki, bilmirəm!» Mərhum Əllamə Təbatəbai öz tələbələrinə «bilmirəm» deməyi öyrədən böyük .ustadlardandır

Deməkutancaqlıqdan vacib şər'i məsələni öyrənməmək, «bilmirəm» deməkdən utanaraq yanlış cavab vermək olduqca pis əxlaqi sifətlərdəndir.

Diqqət edin, əgər insanın öz eybini gizlətməsi onun özü və cəmiyyət üçün zərərli olmazsa daha yaxşı olar ki, bu eyib gizli qalsın. Məsələn, illərcə qabaq çirkin işə yol vermiş adam bu işi xatırlayanda xəcalət çəkir. Başqalarının ona bu işi xatırlatması yol verilməzdir.

## ƏN YAXŞI HƏYA

Sual oluna bilər ki, insan yalnız insandan, yoxsa Allahdan da həya etməlidir? Əvvəla, müəyyən olmalıdır ki, görülən iş nə dərəcədə çirkindir? İkincisi, insan gördüyü çirkin işə nə dərəcədə diqqətli olub? Bu çirkin iş kimin qarşısında baş verib?

Allahın hüzurunu hiss etməyən zəif imanlı insanlar adətən, Allahdan xəcalət çəkmir. İnsan o zaman xəcalət çəkir ki, onun bu çirkin işini görən olsun. İnsan Allahın hər yerdə hazır olduğunu bilsə də bu hüzur insanı günah fikrindən daşındırmır. İnsan Allahın əzəmətini dərk etdiyi qədər də Ondan xəcalət çəkir. Allahın əzəmətindən qafil insan, adətən, vəzifəli, güclü adamların qarşısında səhvə yol verdikdə daha çox xəcalət çəkir. Amma bir çoxları da imkansızlardan, uşaqlardan qətiyyən çəkinmirlər.

Əgər özümüzdə belə bir hal müşahidə ediriksə hökmən tövbə etməliyik. Belə tövbələr rəvayətdə «həya tövbəsi» adlandırılmışdır. İmam Rizanı (ə) ziyarət etdikdən sonra oxuyuruq: «Həya istiğfarı edirik». Allaha diqqət edib öz çirkin işinə görə insan tövbə edərsə bu xalis tövbələrdən olar. Allahın əzəmətini dərk edən insan Onun göstərişini pozub xəcalət çəkməyə bilərmi? Demək, ən üstün həya

Allahdan edilən həyadır. Biz inanırıq ki, gizlində və aşkarda iki nəzarətçi mələyimiz var. .Bütün çirkin işlərimizdən xəbərdar olan bu iki mələkdən xəcalət çəkməliyik

Bir mühüm nöqtə də var: Alt paltarla cəmiyyət arasına çıxmaq pis işdir. Amma insan evdə tək olduğu zaman Allahın hüzurunda olduğunu düşünərək alt paltarda qalmaqda çəkinməsinə ehtiyac yoxdur. Məsələn, ümumi hamamda başqalarından xəcalət çəkmək təbii olsa da kimsəsiz yerdə yuyunarkən Allahdan xəcalət çəkmək yersizdir. Çünki paltar insan nəzəri üçün maneədir. Daş divar arxasındakı insanı görən Allah .üçün libas maneə deyil

İnsan Allahdan o zaman xəcalət çəkməlidir ki, özünə zülm edərək ilahi qanunları pozur. İnsan üçün bütün hallarda Allahı xatırlamaq faydalıdır. Musa peyğəmbər (ə) Allaha ərz edir ki, Pərvərdigara, elə hallar var ki, mən səni düşünməyə xəcalət .(çəkirəm. Allah-təala buyurur: «Məni düşünmək heç halda pis deyil»(١

Allahın çirkin hesab etmədiyi heç bir işə görə xəcalət çəkmək lazım deyil. Xüsusi ilə .ərlə-arvad arasındakı münasibətlərdə xəcalət yersizdir

Həya ən üstün, ən dəyərli insani sifətdir. Çünki məhz həya səbəbindən insan bir çox çirkin işlərdən yaxa qurtarır. Rəvayətdə buyurulur: «Həyası olmayanın imanı .«yoxdur»(٢); «Dini olmayanın həyası yoxdur



---

.Biharul-ənvar», cild ١٣» [٨٨] -١

.Üsuli-kafi» cild ٢, səh. ١٠۶»[٨٩] -٢

İmam Sadiq (ə) buyurur: «Hər şeyin əsası var və İslamın əsası biz Əhli-beytə məhəbbətdir».

İslam bir saraya oxşayır ki, sütunları Əhli-beytə məhəbbətdir. Möhkəm sütunlu binanın ömrü də uzundur. İllər ötdükcə bu binanın zahiri görkəmi dəyişib solğunlaşa bilər. Amma sütunları möhkəm olduğundan onu əvvəlki görkəminə qaytarmaq çox asandır. Amma sütunları möhkəm olmayan bina kiçik bir titrəyişdən müvazinətini itirir və nə qədər tə'mir olunsa da onu ilkin vəziyyətinə qaytarmaq mümkün olmur. İslam möhkəm sütunlara malik olduğundan əsrlərin təlatümlərini əzmlə keçmiş və öz ilkin mahiyyətini qoruyub saxlamışdır.

Bəs nə üçün İslamın sütunu Əhli-beyt məhəbbətidir? Burada isbat və sübuta ehtiyac vardır. İsbat məqamı dedikdə, sübut üçün ayə və dəlillərin varlığı nəzərdə tutulur. Məsələn, yuxarıda zikr olunmuş hədis bu mövzu üçün bir dəlildir. Amma sübut məqamı dedikdə, bu məsələyə aydınlıq gətirilməsi nəzərdə tutulur. Nə üçün Əhli-beytə məhəbbəti olmayan insanın dini süst və kövrək olmalıdır? Biz daha çox sübut məqamını araşdıracağıq.

## DİN VƏ ƏHLİ-BEYT MƏHƏBBƏTİ ARASINDA ƏLAQƏ

Din insanla Allah arasında əlaqə yaratmaq üçündür. Amma bu əlaqə iki amildən asılıdır: tanıma və fitri meyl. İnsan ilk əvvəl gördüyü dünyanın yaradıcısı olduğunu

dərk edir. Anlayır ki, bütün ne'mətlərin sahibi vardır. İkinci mərhələdə qəlbdə bu ne'mət sahibinə məhəbbət yaranmalıdır. Əgər bu tanıma və məhəbbət insan vücudunda formalaşarsa, Allahla bəndə arasında əlaqə üçün şərait yaranar. Amma bu tanıma və məhəbbət insanın doğru yol tutması üçün kifayət etmir. Tarixdə Allahı tanıyıb sevdiyi halda yolunu azanlar çox olub. «Zumər» surəsinin ۳-cü ayəsində buyurulur: «Bil ki, xalis din ancaq Allaha məxsusdur. Allahı qoyub özlərinə dost tutanlar deyirlər: «Biz onlara yalnız Allaha yaxınlaşmaq üçün ibadət edirik». Şübhəsiz ki, Allah ixtilafda olduqları məsələlər barəsində onların arasında hökm edəcəkdir». «Yunus» surəsinin ۱۸-ci ayəsində isə belə buyurulur: «(Müşriklər deyir) Bunlar (bütlər) Allah .«yanında bizdən ötrü şəfaət edənlərdir

Deməki, doğru yolu tapmaq üçün Allahı tanımaq kifayət deyildir. Ona görə də Allah-təala peyğəmbərlər göndərmişdir. Amma bununla da məsələ bitmir. Tarixə nəzər salsaq görərik ki, peyğəmbərləri qəbul etdikləri halda əsl ilahi hədəfdən yayınanlar az deyil. Təkcə İslamda ۸۲ məzhəb və təriqət mövcuddur. Hamı müsəlmanlıq iddiasında olsa da peyğəmbər vəsisinə, canişininə münasibətdə baxışlar haçalanır. İslam dinində Allah-təala Peyğəmbərə (s) canişinlər tə'yin edərək onları müsəlmanlar üçün rəhbər .qərar verir. Beləcə, aydın olur ki, nə üçün Əhli-beyt məhəbbəti İslamın əsasıdır

## ƏHLİ–BEYT MƏHƏBBƏTİ

Cəsarətlə demək olar ki, biz şiələrin İslamdan olan biliyinin ۹۰ faizi Əhli-beytdən öyrəndiklərimizdir. Bu sözü başqa məzhəblər haqqında da demək olar. Sonuncu Peyğəmbər (s) dünyasını dəyişdikdən sonra bəşəriyyət

üçün yeganə ilahi bilik mənbəyi Əhli-beyt mə'sumlarıdır. Onlar üç əsr ərzində insanları ilahi maariflə tanış etmişdir. Allah-təala Qur'ani-Kərimdə öz Peyğəmbərinə (s) buyurmuşdur: «De ki, mən sizdən peyğəmbərliyin müqabilində qohumluq məhəbbətindən başqa bir şey istəmirəm»(١). Peyğəmbər (s) insanlardan yalnız Allaha itaət istəyirdi. «Fürqan» surəsinin ٥٧-ci ayəsində buyurulur: «...Mən sizdən ancaq Rəbbinə tərəf doğru yol tapmaq diləyən kimsələr istəyirəm». Bu iki ayə Peyğəmbər (s) Əhli-beytinə (ə) olan məhəbbətin əhəmiyyətini açıq-aşkar bəyan edir. Əlbəttə ki, bizim .Əhli-beytə məhəbbətimiz yalnız onların Allah dərgahına yaxınlığı ilə bağlıdır

Əgər Allahın mə'rifət və məhəbbətini düzgün şəkildə anlayıb xoşbəxt olmaq istəyiriksə, Peyğəmbər (s) və onun Əhli-beytinə (ə) ardıcıllıq etməliyik. Allaha məhəbbətin sübutu Peyğəmbərə (s) itaət, Həzrətə (s) itaətinin tərkibi olan Əhli-beytə .(ə) bağlılıqdır. Məşhur «Səqəleyn» hədisi deyilənlərə sübutdur

## ƏHLİ-BEYTƏ MƏHƏBBƏTİN YARDIMI

Adi insanlar günahsız olmadıqlarından dini e'tiqadları, əməlləri qüsurlu ola bilər. Əhli-beytə (ə) məhəbbət insanı bir çox fitnələrdən qurtarıb, nöqsanları aradan qaldırar. .Amma Əhli-beyt (ə) vilayətindən uzaqlıq insanı təhlükəli aqibətlə üzləşdirə bilər

Əgər tarixə nəzərə salsaq hətta kəbirə günahlara yol vermiş insanların Əhli-beyt (ə) işığında tövbəyə nail olduğuna şahid olarıq. Əksinə, dini göstərişlərə ciddi



---

.Şura» surəsi, ayə ٢٣» [٩٠] -١

əməl edib, lakin Əhli-beyt məhəbbətindən məhrum olduğu üçün süquta uğrayanlar da .az deyil

Mərhum Teyyub imam Hüseynə (ə) xüsusi sevgisi ilə seçilən insanlardan idi. Onun əzadar dəstəsi məhərrəm mərasimlərində məşhur idi. Teyyub mə'lum Xordad hadisələrində həbs olunmuşdu. Xəfiyyələr Teyyubdan tələb edirdilər ki, qiyamda iştirak üçün imamdan pul aldığını e'tiraf etsin. Belə bir izahat müqabilində onu azad edəcəklərinə söz verirdilər. Amma Teyyub Allah rizasına qiyama qalxdığını bəyan etdi. ...Mücahid müsəlmanı dara çəkdilər

Bu hadisədən sonra çoxları Teyyubu yuxuda gördü. Onun yaxın dostlarından biri müəlliflə görüşündə Teyyubun xatirəsinə Qur'an açmağı xahiş etdi. Allah şahiddir ki, səhifənin ilk sözü «teyyib» və ilk ayəsi bu idi: «Pak söz Ona tərəf yüksələr və pak sözü də .(yaxşı əməl qaldırar»(١

Teyyub adi bir müsəlman idi. Amma Əhli-beytə aşiq olan adi bir müsəlman! Məhz bu .məhəbbət Teyyubu xeyirli bir aqibətə ... şəhadətə qovuşdurdu

Bunu da qeyd etməliyik ki, insanın qəlbi elə həddə çirklənə bilər ki, Əhli-beyt .məhəbbətinə layiq olmaz

## MÜNAFİQ» SÖZÜNÜN ƏHLİ-BEYT DÜŞMƏNİ KİMİ TƏFSİRİ»

Hədid» surəsinin ١٣-١۴-cü ayələrində buyurulur: «O gün münafiq kişi və qadınlar iman» gətirənlərə deyəcək: «Gözləyin ki, nurunuzdan bir qədər işıq alaq». Onlara belə cavab veriləcək: «Geriyə dönüb işıq axtarın». Bu sözlərdən sonra mö'minlərlə münafiqlərin arasına içəri



---

.Fatir» surəsi, ayə ١٠» [٩١] -١

tərəfi mərhəmət və bayır tərəfi əzab olan sədd çəkiləcəkdir. Münafiqlər mö'minlərə deyəcək: «Biz sizinlə birlikdə deyildikmi? Mö'minlər belə cavab verəcəklər: «Birlikdə idiniz, amma siz özünüzü fitnəyə saldınız, gözlədiniz və şəkk etdiniz. Allahın əmri gəlib .«çatanadək sizi xam xəyallar və tamah aldatdı

Ayədə zikr olunmuş divar ərəbcə «sur» kimi işlənmişdir. Maraqlıdır ki, söhbət mö'minlərlə kafirlər yox, mö'minlərlə münafiqlər arasındakı divardan gedir. Bu münafiqlər mö'minlərlə birgə məscidə gələr, namaz qılar, Qur'an oxuyardılar. İndi isə ayrılırlar. İmam Sadiq (ə) buyurur: «Ciyərlər susuzluq şiddətindən od tutar». Bəli, söhbət ?qiyamət günündən gedir. Əzabla dolu bu gündən qaçıb qurtarmağa yer varmı

İmam Sadiq (ə) buyurur ki, mö'minlərlə münafiqlər arasındakı divar nurdandır. Bir .tərəfdə bizə xidmət etmiş Əhli-beyt dostları, digər tərəfdə isə Əhli-beyt düşmənləridir

Rəvayətdən belə mə'lum olur ki, imanın həqiqi və zahiri olması Əhli-beyt vilayətinə .məhəbbətdən asılıdır

Xülasə, hər şeyin əsası olduğu kimi İslamın da əsası var və bu əsas Əhli-beytə !məhəbbətdir. Belə möhkəm əsasa malik saray üçün heç vaxt uçulma təhlükəsi yoxdur

Ya Rəbb, Əhli-beyt vilayəti və onun məhəbbətini qiyamət gününədək bizim üçün qoru !və qəlbimizi bu nurdan məhrum etmə

**MÜNDƏRİCAT**

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ٩

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ٢٠٠۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.١

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.٢ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .٣ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.١

